**Redaktor və ön sözün müəllifi:**
**Tacir SƏMİMİ**
*filologiya üzrə fəlsəfə doktoru*

**Məsləhətçi:**
**Nazim MUSTAFA**
*tarix üzrə fəlsəfə doktoru,*
*Dövlət Mükafatı laureatı*

**Rəyçi:**
**Sönməz ABBASLI**
*filologiya üzrə fəlsəfə doktoru, dosent*

**Səadət Hacıyeva.**
**Nanaylı-halaylı dünyam.**
Bakı, "SkyG", 2017.

Bu kitabda Ağbaba bölgəsinin etnoqrafiyasını əks etdirən materiallar ("Xıdır Nəbi", "Qızlar bayramı", "Ramazan bayramı", "Qurban bayramı", toy mərasimi və b.), bölgənin folklorundan örnəklər (alqışlar, qarğışlar, nağıllar, rəvayətlər, vəsfi-hallar, nanaylar, nazlamalar, oxşamalar və b.) toplanmışdır. Kitabda həmçinin müəllifin toplayıb yazıya aldığı örnəklərlə bərabər bayatıları, şeirləri, bir poeması və xatirələri də verilib.

Kitab geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

**ISBN 978-9952-440-08-05**

# SAZLI-SÖZLÜ AĞBABA

Səadət Hacıyeva qədim Oğuz elinin sazlı-sözlü və zəngin ədəbi mühiti olan bölgələrindən birində – Ağbaba elində doğulub boya-başa çatmışdır. Burada Şirəkli Həsən, Aşıq Qərib Həsən, Aşıq Alışan, Aşıq Məhərrəm, Aşıq Heydər, Yetim Tapdıq, Qərib Rza, Çorlu Məhəmməd, Aşıq Nəsib, Aşıq Məhəmməd, Aşıq İsgəndər Ağbabalı, Aşıq Paşa Göydağlı, Aşıq Ziyəddin və başqa el sənətkarları yaşayıb-yaratmış, elin sözünü eldən-elə, dildən-dilə yaymışlar. Ağbabanın folklor çeşməsindən su içən Səadət Hacıyevanın yaradıcılığı və topladığı materiallar əslində, bir folklor qaynağıdır.

Onun bayatılarında Ağbabanın kəndlərinin adları bir-bir sadalanır, qədim-qayım bir eli öz yurd-yuvasından didərgin salan ermənilər lənətlənir.

Ağbabanı görməyən, onun haqqında məlumatı olmayan oxuculara Səadət Hacıyevanın eli, obası, onun tarixi keçmişi haqqında qısaca məlumat verməyi zəruri hesab etdik.

"Oğuznamə"lərdə və "Kitabi-Dədə Qorqud" dastanında adı çəkilən yüzlərlə yer-yurd adlarına QərbiAzərbaycan (indiki Ermənistan) ərazisində, o cümlədən də Ağbaba-Şörəyel nahiyələrində hər addımda rast gəlinərdi. Bu, ona dəlalət edirdi ki, qədim oğuz boyları həmin ərazilərdə hələ islamaqədərki dövrlərdən yaşamışlar.

Cənub-Qərbi Qafqazda Ələyəz (Alagöz) dağının ətəklərindən tutmuş, Arpaçay boyunca uzanan və Arpa gölünün ətrafını əhatə edən ərazinin dağlıq hissəsi Ağbaba və Qayqulu eli, aran hissəsi isə Şörəyel adlanmışdır. İndiki Ermənistan ərazisində qalan, 1930-cu ildən Amasiya

rayonu adlandırılan Ağbaba nahiyəsi qərbdən Ağbaba dağ silsiləsi, şimali-qərbdən Türkiyənin Çıldır nahiyəsi, şimaldan Axıska paşalığının Axılkələk nahiyəsi və şərqdən Qayqulu eli (Qızılqoç rayonu) ilə əhatə olunmuş dağlıq ərazidir. Qayqulu eli isə şimaldan Dağ Borçalı nahiyəsi, şərqdən Calaloğlu və Pəmbək nahiyələri ilə əhatə olunmuşdur.

Mənbəyini Çıldırətrafı dağlardakı bulaqlardan və Arpagöldən götürən, Ağbaba dağlarının ətəkləri ilə qıvrıla-qıvrıla axan, Şörəyeldə Araza qovuşan Arpaçay, Şörəyelin özünü də iki hissəyə ayırır. Qars vilayəti ərazisində qalan hissə Qərbi Şörəyeldir. İkinci hissəsi Şərqi Şörəyeldir ki, indiki Ermənistan ərazisindədir. Şərqi Şörəyel Ələyəz, Cacur, Yasovul, Qarakahya və Saqqızlı dağları ilə əhatə olunmuş, əsasən, düzənlik ərazidir.

Şörəyel nahiyəsi dəniz səviyyəsindən 1500-1800 metr, Ağbaba nahiyəsi isə 1800-2200 metr yüksəklikdə yerləşir. Coğrafi rayonlaşmaya görə Ağbaba və Şörəyel ərazisi Şirək yarımrayonu sayılır. Çılpaq dağlarla əhatə olunmuş Ağbaba nahiyəsi heyvandarlıq, Şörəyel nahiyəsi isə əkinçilik üçün yararlıdır.

Ümumiyyətlə, hazırda Ermənistan ərazisində qalan Ağbaba, Şörəyel və Qızılqoç nahiyələrinin birgə ərazisi 2680 kv.km təşkil edir ki, vaxtilə bu ərazilərdə 200-dən artıq türk kəndləri mövcud olmuşdur.

Ağbaba bölgəsi 1877-1878-ci illər rus-türk müharibəsindən sonra hərb təzminatı əvəzinə Üç Sancağın (Qars, Ərdahan, Batum) tərkibində Rusiyaya birləşirilmişdi. Ağbaba nahiyəsi Qars vilayətinin hərbi-inzibati ərazi bölgüsü daxilində Qafqaz Canişinliyinə tabe edilmişdi.

XX əsrin əvvəlində Ağbaba nahiyəsində 39 kənd olmuşdur ki, bunlardan da cəmisi 2 kənddə – Qaraməmməd və Bəzirganda “qaxdağan” (köçkün) ermənilər yaşamışlar.

Ağbaba Şurası bölgə əhalisini erməni hücumlarından qorumaq üçün yerli səfərbərlik keçirir və Ağbaba süvari alayını təşkil edir. Belə qayda qoyulubmuş ki, əsgər verə bilməyən ailələr bir tüfəngin pulunu və bir at, yaxud bir inə kverməliidilər. Bu qaydaya əməl etməyənlər ciddi cəzalandırılmışlar.

1921-ci il Moskva və Qars müqavilələrinə əsasən Ermənistanın tərkibinə qatılmış, bu dəfə isə nahiyə kimi Aleksandropol (Gümrü) qəzasının tərkibinə daxil edilmişdi. Yeni sərhəd xəttinə görə, nahiyənin Köhnə İbiş, Bəzirgan, Dəvələr kəndləri Türkiyə tərəfdə qalmışdı. Ermənistanın hakimiyyətini qəbul etməyən əhaliyə Qars müqaviləsinə əsasən öz əmlakları ilə birlikdə Türkiyəyə köçməyə icazə verilmişdi. Bundan sonra Ağbabanın Sınıx, Mumuxan, Köhnə Qızıldaş, Qoncalı, Ördəkli, Seldağılan, Mustuqlu, Baxçalı, Söyüdlü, Təzəkənd və Şiştəpə kəndlərinin türkləri elliliklə Türkiyəyə köçmüşdülər. Bu vaxt Aşıq Alışan, Sınıqlı Kəndirbaz Alı, Aşıq Əli, Aşıq Məhərrəm və başqa el sənətkarları da Türkiyəyə pənah apardılar. Ağbaba nahiyəsinin Qars vilayətinin tərkibindən ayrılıb Ağbaba nahiyəsinin 594,75 kv verst ərazisinin 450 kv versti – 34 kənd Ermənistana qatılmışdı. Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra nahiyənin mərkəzi yenə də Hamasa (Amasiya) kəndi olmuşdur. Hamasa – qədim türk dilində qəhrəmanlıq, igidlik yurdu deməkdir.

Sovet Ermənistanı dövründə Gümrü qəzasına daxil olan Şərqi Şörəyel ərazisində Düzkənd (Axuryan), Ağin (Ani) və Ərtik (Artik) rayonları təşkil edilmişdi.

1920-ci illərin əvvəllərində Ağbaba nahiyəsində ermənilər yeganə olaraq Qaraməmməd kəndində (Qara Məhəmməd Hamasanın tanınmış ağasıdır, bu kəndin adı onun adı ilə bağlıdır. Ağanın Qarammәd tapı, Qarəmməd yaylası da məlumdur) yaşayırdı. Sovet hakimiyyətinin ilk illərində Ağbaba nahiyəsində ermənilərin sayını artırmaq məqsədilə Arpaçayın sol sahilində yerləşən, əvvəllər Qızılqoç nahiyəsinə daxil olan və Türkiyədən köçürülmüş ermənilərin yerləşdikləri Cələb və Bəndivan erməniləşmiş, yunanların yaşadığı Baytar kəndlərini nahiyənin tərkibinə daxil etmişdi. Bundan sonra nahiyə mərkəzində erməni məmurları məskunlaşmağa başlamışdılar.

1918-1920-ci illərdə erməni-türk müharibələri zamanı Qars vilayətindən gəlib Gümrü ətrafında yerləşən erməni ailələrinin bir qismini 20-ci illərin əvvəllərində, əsasən Sınıx, Mumuxan, Təzə Qızıldaş, Qıdaşen (Tezbahar), Çaxmaq və Qoncalı kəndlərində yerləşdirilmişlərsə də, sonradan ermənilər həmin kəndləri tərk edərək Gümrüdə məskunlaşmışdılar.

1930-cu il sentyabrın 30-da Ağbaba nahiyəsinin əsasında Amasiya rayonu təşkil edilmişdi. 1936-1938-ci illər repressiyası zamanı daşnak tör-töküntülərinin əlinə gözəl fürsət düşmüş, Amasiyanın bütün kəndlərində xalq arasında nüfuzu olan, az-çox savadlı sayılan türkləri Türkiyədə qohumları olması və onlarla gizli əlaqə saxlamaları adı altında həbs etdirmiş, onlara siyasi dustaq damğası vurduraraq

Sibirə və Qazaxıstana sürgün etdirmişdilər. Tutulanların bir çoxları “troyka”nın qərarı ilə güllələnmişdi.

Ermənistandan türklərin 1948-1953-cü illər köçürülmələri dağlıq Amasiya rayonundan da yan keçməmişdi. Əhalisinin 90 faizindən çoxunu türklər təşkil edən Amasiya rayonu bir tərəfdən Türkiyə, digər tərəfdən Gürcüstanın Boqdanovka və Axılkələk rayonları arasında yerləşdiyindən, Ermənistan rəhbərliyi həmin rayonu da köçürmək qərarına gəlmişdi. “Ermənistanın Sibiri” adlandırılan Amasiya rayonunun Qarabulaq, Qızılkənd, Şurabad və Daşkörpü kəndləri Azərbaycanın ilan mələyən aran rayonlarına köçürülmüşdü.

1987-ci ilin əvvəlində rayonun 21 min nəfər əhalisindən təqribən 18 min nəfərini türklər təşkil edirdilər. Belə ki, 27 kənddən 21-də sırf türklər, 5 kənddə ermənilər, rayon mərkəzində isə türklərlə ermənilər qarışıq yaşayırdılar. Rayonda yaşayan bütün ermənilərin sayı təkcə Güllübulaqda yaşayan türklərin sayından bir azca çox idi. Buna baxmayaraq, rayonda nomenklatur vəzifələrin 85%-ni ermənilər tutmuşdular.

O cümlədən, Rayon Soveti İcraiyyə Komitəsinin sədri, rayon prokuroru, milis rəisi, hərbi komissar, DTK-nın sədri, Xalq Nəzarəti Komitəsinin sədri, Aqrar-Sənaye Birliyinin sədri, İstehlak Cəmiyyətinin sədri və s. kimi məsul vəzifələrə İrəvanda xüsusi təlim keçmiş millətçi kadrlar yerləşdirilmişdi. Bu kadrların əli ilə istənilən vəzifəli türkü ləkələyib aradan götürürdülər. Məhz bu kadrların və İrəvandan göndərilmiş digər emissarların ciddi səyləri ilə 1988-1989-cu illərdə Amasiya türklərinin deportasiya ak-

siyası həyata keçirildi və qədim Oğuz eli Ağbaba və Şörəyel türksüz əraziyə çevrildi.

1988-ci il fevralın 20-də DQMV Xalq Deputatları Sovetinin yalnız erməni deputatların iştirakı ilə keçirilən növbədənkənar sessiyası vilayətin Azərbaycanın tərkibindən çıxarılıb Ermənistanın inzibati-ərazi bölgüsünə daxil edilməsi haqqında qərar qəbul etdi. İş o yerə çatmışdı ki, mart ayında Gürcüstanın Boqdanovka və Axılkələk rayonlarında yaşayan ermənilər Amasiya rayonunun Yeniyol və Göllü kəndlərinə silahlı basqınlar etmişdilər.

18 min əhali girov kimi qalmışdı. Rayondan kənara çıxan azərbaycanlıları ölüncəyə qədər döyürdülər. Ümid təkcə vertolyotlara qalmışdı.

Əsas çıxış yollarını silahlı erməni quldurları ələ keçirdiklərinə görə, Ermənistanın Azərbaycanla həmsərhəd rayonlarının azərbaycanlı əhalisi maşınlarla deyil, qışın qarlı-boranlı günlərində dağlardan piyada aşaraq özlərini Azərbaycana çatdıra bilmişdilər. Krasnoselo, Basarkeçər Vardenis, Sisyan, Qafan, Gorus, Razdan, Əzizbəyov, Amasiya rayonlarından 48 nəfər dağları aşarkən borana düşüb həlak olmuşdular. 1988-1989-cu illərdə təkcə Amasiya rayonunda azərbaycanlılara verilən işgəncələr, edilən zorakılıqlar nəticəsində, qarlı-şaxtalı dağları aşarkən 12 nəfər ölmüşdür.

Erməni vandalları Ağbabanın kəndlərinin adlarını aşağıdakı qaydada dəyişdirmişlər:

**Güllübulaq** - Byurakn, **Qxçoğlu** - Voxçi, **Qaraməmməd** - Meğraşad, **Çaxmaq** - Kamxut, **Mağaracıq** - Qdaşen, **Qaraçanta** - Əzizbəyov - Areqnadem, **Hamasa** - Amasiya, **Cələb** - Cadzor, **İlli** - Hoğmik, **Baytar** - Hovtun,

**Daşkörpü** (ləğv edilib), **İbiş** - Yerizak, **Qoncalı** - Zarişad, **İlanlı** –Çaybasar - Aravet, **Düzkənd** - Alvar, **Qaranamaz** – Yeniyol - Ağvorik, **Göllü** - Ardenis, **Təpəköy** – Berdaşen, **Sultanabad** - Şurabad - Paxaki, **Balıqlı** - Zorakert, **Öksüz** - Darik, **Güllücə** - Çaxkut, **Elləroyuğu** - Ellərkənd - Lorasar, **Hozukənd** - Quzukənd - Qarnariç, **Çivinli** –Yeğnacur, **Qarabulaq** - Şağik.

Zənn edirik ki, Səadət Hacıyevanın toplayıb yazıya aldığı folklor örnəkləri, etnoqrafik məlumatlar Ağbaba folklorunun zənginliyini və özünəməxsusluğunu əks etdirməklə oxucularda Ağbaba-Şörəyel elləri barəsində müəyyən təsəvvür yaradacaq, sazlı-sözlü Ağbabanın mənəvi dünyasının qapılarını onların üzünə açacaqdır.

**Nazim MUSTAFA,**
*tarix üzrə fəlsəfə doktoru,*
*Dövlət Mükafatı laureatı*

# SƏADƏT HACIYEVANIN TOPLAMA İŞİ VƏ YARADICILIĞI

Səadət Hacıyeva Ağbaba bölgəsinin mərkəzi Hamasa (indiki Amasiya) qəsəbəsində tanınmış maarif xadimi Güləhməd Hacıyevin ailəsində dünyaya gəlib. Güləhməd müəllimin bölgədə maarifin inkişafında, təhsilin tərəqqisində böyük xidmətləri olub. Səadət Hacıyeva hələ uşaq yaşlarından həm atasından, həm də anası Gövhər xanımdan görüb-götürmüş, dayısıgildə tez-tez keçirilən aşıq məclislərində, eləcə də nanayoxumalarda folklora vurulmuş, adət-ənənlərə daha yaxından vaqif olmuşdur. Bir sözlə, Hamasanın zəngin və münbit ədəbi mühiti onda saza-sözə maraq oyatmış, bədii yaradıcılığa da həvəsləndirmişdir. Özü də yeri gəldikcə, bölgə folklorundan nümunələri də toplayıb yazıya almış, adət-ənənələrlə bağlı məsələlərə də maraq göstərdiyindən Ağbabada keçirilən bayramlar və toy mərasimi haqqında materialları da bir yerə toplayıb işləmişdir.

Səadət Hacıyeva Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsini bitirmiş və Ağbaba-Şörəyel folklorundan diplom işi yazmışdır. O, 1988-ci ildə yaşadığı Amasiya rayonunun Güllübulaq kəndindən didərgin düşərək Bakı şəhərində məskunlaşmışdır.

Kitabda S.Hacıyeva öncə "Xıdır Nəbi" bayramından söz açır. O qeyd edir ki, bölgədə bu bayramı Novruza 40 gün qalanda xüsusi təmtəraqla keçirirdilər. O yazır: "Bu bayram üçün payızdan ağ buğda təmizlənib sacda qovrulardı. Qovurğanı kirkirədə çəkib qovut eləyərdilər. Onu ələkdən, daşqırdan keçirib qovudun yarmasını ayırardılar. Ununu (qovudunu) sarı yağla, südlə, şəkərlə çalıb qarlı

qışın uzun gecələrində nağıllı söhbətlər zamanı həvəslə yeyərdilər, yarmasını isə Xıdır Nəbi bayramı günü təndir qalayıb xaşıl asardılar. Xaşılı sarı mayıs yağı, qurut və ya qatıqla yeyərdilər. Həmin gün bütün evlərdə adətə görə xaşıl bişirərdilər. Gənc qızlar, oğlanlar həmin xaşıldan çörəyin üstündə qoyub eşikdə ot tayasının, ya örtmənin üstünə qoyub gizlənərdilər. Sərçələr hər kəsin xaşılını dimdiyinə alıb hansı tərəfə uçsa, demək, həmin gənc o tərəfdən qız alar, qız isə həmin tərəfə gəlin köçərdi. Bu, dədə-babadan sınanmış adətdi".

Bəs bu bayram, mərasim niyə Xıdır Nəbi adlanır? Təbii ki, bu, ilk öncə Xıdır Nəbi ilə bağlıdır. Bu barədə toplayıcı yazır: "Həmin günü mütləq hava pozular, qar-çovğun olardı. "Birdən Xıdır Nəbi bizdən keçər, özü də, atı da ac-susuz qalmasın" – deyərdilər. Səhər duran kimi qovutda, suda, qovurmada, un anbarında, yağ küpəsində Xıdır Nəbinin əl, ayaq izlərini axtarardılar. Deyilənə görə, onun əli, ayağı dəyən yer bərkətli olar, bərəkət tükənmək bilməzmiş".

S.Hacıyeva Qızlar bayramının (buna Ağbaba kəndlərində "Çilə-çilə çıxarma" da deyirdilər) axır çərşənbədə keçirildiyini göstərir. Qeyd edir ki, qızlar halay çəkib oynaya-oynaya deyişər, nanayların musiqisini dəyişər, sonra qulaq falına çıxar, bundan sonra bir yerə toplanıb gətirdikləri "lal su"ya iynə salıb fal açardılar. O yazır: "İynələr bir-birinə yaxınlaşıb qoşa durana qədər oxuyardılar. Əgər iynələr qoşalaşırdısa, deməli, həmin qızla oğlan qovuşacaq. Bəzən iynələr suya batardı. Bu da o demək idi ki, həmin qızla oğlanın bəxti bir deyil".

Burada verilən "Toy mərasimi" Ağbabanın regional cəhətlərini özündə əks etdirməkdədir. Xınayaxdı mərasi-

mində qızların motivini dəyişə-dəyişə nanay oxuması, eləcə də təzə gəlinin tərifi xeyir işdə musiqi folklorundan geniş istifadəni təsdiqləyir.

Toplama materiallarının içində xeyli rəvayət də vardır. Bunlardan biri də “Arxadur” adlı rəvayətdir. Burada gəlinin qaynanasına etdiyi zülmdən söz açılır. Amma gəlinin ərinin bundan xəbəri olmur. Yəni gəlin qaynananı ac saxlayır, oynamağa məcbur edir və bundan həzz alır. Amma Arxadur anasının gündən-günə zəiflədiyini görüb bunun səbəbini soruşanda anası işin nə yerdə olduğunu deyir. O da işə getmək adı ilə bir xəlvət yerdə gizlənib arvadının çıxardığı oyuna tamaşa edir. Ana cızıqda oynaya-oynaya oxumağa başlayır:

Axadur, yük dalından baxadur,
Gündə günüm belədir.
Şəftəlidən şələdir,
Saqqız verib çeynədir,
Cızıq çəkib oynadır.

İşi belə görən Arxadur arvadını döyüb-söyüb evdən qovur.

Başqa bir rəvayət həcmcə böyük olmasa da olduqca yaddaqalandır. Burada təsvir olunur ki, iki qıza toy olur. Bunlardan biri varlı, o biri kasıb qızıdır. Varlı qızı cehizlərini kasıb qızına göstərib öyünür ki, gör mən nələr cehiz aparıram. Kasıb qızı ona belə cavab verir:

– Sən qızıldan teşt apar, mən də bəxt aparıram.

“Tənbəl qız” da maraqlıdır. Təsvir edilən qız gözəl olsa da, tənbəlliyinə görə ona elçi düşən olmur. Axırda ona bir kasıb oğlan elçi düşür, toy eləyib onu evinə aparır.

Oğlan qızı yavaş-yavaş iş-gücə öyrədir, ona tənbəlliyi tərgitdirir. Amma qızın atası narahat olduğundan axırda dözməyib qızıgilə yollanır, qorxur ki, qızının tənbəlliyindən söz açarlar. Qız onu mehribanlıqla qarşılayır, qulluq eləyir. Ata qızının işgüzarlığına heyrətlənəndə qızı deyir:

– Dədə, sən də bu sarımsaqları əz, yoxsa sənə yemək verməzlər, təndirdə baş-ayaq var. İndi gələrlər, birlikdə yeyərik. Bunlarda iş görməyənə yemək vermirlər.

Qız atası işi başa düşüb rahat olur.

“Qarğa” rəvayəti də maraqlıdır. Burada baba və nəvə münasibətləri verilib. Göstərilir ki, nəvə uşaq vaxtı qarğanı babaya göstərib bəlkə yüz dəfə soruşur ki:

– Bu nədi?

Baba da hər dəfə deyir:

– Qarğadı.

Amma bir dəfə də olsun hirslənmir.

Baba qocalıb əldən düşəndə nəvəsini sınamaq üçün çəpərin başına qonan qarğanı göstərib deyir:

– A bala, hasarın başındakı nədi elə?

Nəvə “qarğadı” deyir. Baba bir də soruşanda nəvə səsini qaldırır:

– Qarğadı.

Baba bir də soruşanda nəvə daha da acıqlanır:

– Qarğadı.

Baba köksünü ötürür:

– Bilirəm, qarğadı, a bala. Sənin uşaqlığını yadıma saldım. Sən də uşaq olanda bu sualı mənə bəlkə yüz dəfə vermişdin. Amma mən sənə hirslənməmişdim. Hər dəfə “can, qurban olum”la cavab vermişdim.

“Daşdəmir”, “Xaşıl əhvalatı”, “Eşşək əhvalatı”, “Dünya qarışır”, “Fırım tutub”, “Bircə səni də mineydim”

kimi rəvayətlərdə avamlıq, kələkbazlıq, eyni zamanda vəziyyətdən çıxmaq, hazırcavablıq kimi maraqlı əhvalatlar əks olunmuşdur.

Toplanıb yazıya alınan maraqlı rəvayətlərdən biri də "Ağzım dada gəldi"dir. Burada Allahquluya vurulan sərsəm, ağlından qıt qarının macəralarından bəhs olunur. Əvvəlcə israrla qarı oğlanlarından tələb edir ki, onu Allahquluya ərə versinlər. Bundan acıqlanan oğulları onu canavarın yuvasının ağzına qoysalar da, sonradan peşman olub evə gətirirlər. Amma gecə arvad Allahqulunun məhəbbətindən yata bilmir, elə bu vaxt evə oğrular gəlir. Arvad yalandan zarıyır:

– Ay Allahqulu, ay Allahqulu, hoy...

Arvadı susdurmaq üçün oğrulardan biri onun ağzına bir ərik qoyur. Arvad deyir:

– Ağzın dada gəlsin, ay Allahqulu, ağzım dada gəldi.

Oğrular arvadın kirimədiyini görüb əriyi onun ağzından çıxarırlar. Yenə arvad danışmağından qalmır:

– Ay Allahqulu, ay Allahqulu, hoy...

Oğrular qorxularından qaçıb gedirlər.

"Saman əhvalatı"nda Məşədi Həşim qonşusu Məşədi Mirzənin mərəyindən hər gecə saman aparır. Hər dəfə içəri girəndə ev sahibi içəridə imiş kimi, ona salam verib, guya sonra ondan saman istəyir. O da "hə" cavabı verir, bu da saman aparır. Axırda ev sahibi işi başa düşüb bir gecə mərəkdə gizlənir. Gecədən xeyli keçmiş qonşusunun kamali-ədəblə salam verib saman istəməsi, sonra "hə" cavabı alıb getmək istəyəndə ev sahibi gizləndiyi yerdən çıxıb səbəti onun dalına qaldırır, çünki qonşunun hazırcavablığı onun xoşuna gəlir.

Folklor örnəkləri arasında vəsfi-hallar həm sayca çox, həm də diqqətçəkicidir. Maraqlıdır ki, bu folklor örnəklərinin bəzisində eyhamla ehtiyatlandırma, özünə diqqət yetirmə də hiss olunur.

Bunu aşağıdakı nümunədə görmək mümkündür:

Oğlan, adın Ənnağı,
Kəkilin bostan tağı.
Necəsən, gözdən salam,
Olasan çarıq bağı.

Deməli, bu Ənnağı deyilən nəsə yaxşı iş görmədiyindən onun sevdiyi qız ona eyhamla qandırır ki, bir də belə hərəkət etsə, onu "çarıq bağı" hesab edəcək.

Elə vəsfi-hallar var ki, orda şikayət hiss olunmur, daha doğrusu, xeyir işin yubanmasının yaxşı əlamət olmadığı bildirilir. Buna misal olaraq aşağıdakı nümunəni göstərə bilərik:

Oğlan, adın Asdandı,
Gün dağlarda yasdandı.
Verdiyin qızıl üzük,
Barmağımda pasdandı.

Əlbəttə, qızıl paslanan metal deyil, amma "paslandı" burada vədənin-vaxtın uzanmasına işarədir.

Bu toplama işində yazıya alınan vəsfi-halların arasında deyişmə şəklinə də rastlanır. Məsələn, aşağıdakı iki nümunəyə baxaq:

Çaxmağı çaxan ölsün,
Qıyqacı baxan ölsün.
Mən səni çox sevirəm,
Sənə kəc baxan ölsün.

Çaxmağı çaxdın, neynim,
Qıyqacı baxdın, neynim?
Uydun elin sözünə,
Evimi yıxdın, neynim?

Buradan məlum olur ki, oğlan elin sözü ilə sevgilisindən ayrılmışdır, peşman olsa da, qız ona "evimi yıxdın" deməklə, ona inamının itdiyini bildirir.

Vəsfi-halların bəzilərində həqiqi sevgi ustalıqla əks olunur. Məsələn:

Yolu yol elədi qız,
Yola gül ələdi qız.
Açdı sinə bəndini,
Yara əl elədi qız.

Başqasında könlü olanlara baxmaq, onlardan sevgi ummaq yaxşı əlamət sayılmadığından bu örnəklərdə buna da yer ayrılmışdır:

Qar yağır kəpək kimi,
İşıldar ipək kimi.
Arxamca nə baxırsan
Qudurmuş köpək kimi.

Bəzi örnəklərdə ər xüsusi sevgi ilə təsvir edilir:

Mənəm dağın lalası,
Sənə fəda olası.
Boyuna qurban kəsim,
Qaynanamın balası.

Burada "qaynanamın balası" ərdir, evin kişisidir.

Vəsfi-hallar arasında səhvə yol verən oğlanlara rişxəndə də rast gəlinir:

Əlində nal oynadır,
Cibində pul oynadır.
Kül başına, ay cavan,
Qız qoyub, dul oynadır.

Burada bir təəssüflənmə də var. Yəni, qoldan güclü, varlı-hallı bir gənc qız əvəzinə dul alıb. Maraqlıdır, elə vəsfi-hallar var ki, o örnəklərdə qoşulub qaçmağa işarələr də yox deyildir. Məsələn:

Arxalığın qədək, yar,
Geymə, gələr gödək, yar.
Get atını mahmızla,
Gəl bərabər gedək, yar.

Burada "arxalığın oğlana gödək gəlməsi" əslində bir hiylədir. Yəni "libasını dəyiş" mənasındadır, niyə o "atını mahmızla" deyir, deməli, oğlan tələsməlidir, dördüncü misra qızın nə dediyini aydınca göstərməkdədir, yəni məni götür, qaç.

Bu kitabda verilən uşaq folkloru sayca az olsa da maraqlıdır.

Məsələn:

Şələsi şəkər,
Qadan alım.
Dədəsinə nökər,
Qadan alım.

“Nökər” sözündən bəlli olur ki, oğlan uşağını əzizləyirlər, həm də bu sözlə adamlar dədə-babaya hörmətlə yanaşmağı, onlara qulaq asmağı tövsiyə etməkdədirlər.

İndi başqa bir nümunəyə baxaq:

Mən sənə qurban,
Sən mənə yox.
Çərçilər gəldi,
Muncuğu çox.
Hər rəngi var,
Qırmızısı yox.

Bundan, yəni muncuqdan bəllidir ki, söhbət qızdan gedir.

Deyimlər arasında aşağıdakı sözlər xüsusilə diqqəti çəkəndir:

A gülüm, gülüm, gül dərim,
Səni bazara göndərim.

Burada “gül” sözü üç dəfə təkrar olunduğundan bu ifadə həm də yaxşı yadda qala bilir.

Şeirdəki, şeiriyyətdəki təsir gücü, həyatilik, nəcib hisslər, duyğular həmişə adamlara güc-qüvvə, təpər verib, təsəlli, təskinlik verən olub. Həmişə insanı yaşamağa səsləyib, onu acizlikdən xilas edib. Səadət Hacıyevanın şeirləri ilə tanış olandan sonra bir daha bu qənaətə gəldik. İstər-istəməz böyük şairimiz M.Şəhriyarın şeirə verdiyi dəyəri də xatırladıq. O deyirdi:

Sönmüş ürəklərdə məşəl yandırar,
Şeir duyanları qanadlandırar.
Şadlıqdır, sevincdir, qəmdir, kədərdir,
Ən böyük, ən dərin düşüncələrdir.

Amma müəllifin şeirlərinin arasında sevincini, şadlığını əks etdirən nümunələrə rast gəlmədik, şeirlərin əksəriyyətindən dərd-sər, kədər yağır, dərdin neçə-neçə çaları, qara notlarının tündlüyü adamı heyrətləndirir. Bu təsadüfdürmü? Zənnimizcə, yox. Elə burdaca el şairi Xəstə Zərnişanın bir sözü yadımıza düşür: “Şeir can ağrısıdı. Dərdimi onunla deyəndə bir az rahat oluram. Görmürsünüzmü, hər vaxt şeir demək olmur, dərd betər gələndə o da gəlir...”. Bununla bərabər mövlana aşığımız Qənbərin dedikləri də bizi tərpədir: “Adamı dərd tərpətməsə ondan nə şayır, nə də aşıq olar. Dərdi olmayan adam vecsiz adamdı, ondan nə insaf-mürvət, nə də qanacaq gözləmək olar. Hə, dərd adamı tərpədəndə onun dediyini qələmlilər dəftərlərinə yazarlar, mənim kimi qələmi olmayanlar, yəni məktəb, təhsil görməyənlər də könül dəftərlərinə yazarlar, dilnən deyərlər. Yadda qalanı da olar, itib-batanı da”. Bəli,

sözümüzün əvvəlinə qayıdaq, müəllifin şeirlərində kədər, qəm notları olduqca tünd boyalarla verilib. Burada Vətən həsrəti, yurd niskili motivləri daha çox üstünlük təşkil edir. Öncə Səadət müəllimənin bayatılarına diqqət yetirək:

Nə yazım...
Nə düşünüm, nə yazım?
Didərginlik qoyarmı,
Gələ baharım, yazım?

Müəllif haqlıdır, yurd itirməkdən ağır, betər dərd yoxdur, təbii ki, o, bahar-yazı da didərginə unutdurar, onu sevinməyə, dəmə qoymaz. Axı, onun fonunda yurdun gözəl mənzərələri görünür, səfalı dağları, gur bulaqları adama gəl-gəl deyir. İndi bu gözəlliklər unudulmaz olduğu qədər də əlçatmazdır, dərd də bundan başlanır... Sanki müəllif bunları göz önünə alaraq deyir:

Dəmlər ilə yox aram,
Dərdlər ilə mən varam.
Vətən dərdimə dərman,
Mən dərmansız sızlaram.

Zənnimizcə, burda əlavə şərhə ehtiyac yoxdur. Yəni, müəllif haqlıdır. Bəli, didərginin var olan dərdinin dərmanı vətəndir.

S.Hacıyevanın bayatıları adamı öz cazibəsindən çıxmağa qoymur, həm heyərtləndirir, həm duyğulandırır, bir daha vətən həsrətinin ağır dərd olduğunu yada salır. O yazır:

Bu kənd Tezbahardımı?*,
Selə dönən qardımı?
Vətən deyib ağlaram,
Qulaqların kardımı?

Bu bayatı kimə ünvanlanıb? Duyğulu adamlaramı, fələyəmi? Bilmirik. Amma bu bədii sual bayatıya təbiilik gətirib, onun yadda qalmasına da təminat verməkdədir.

Əlbəttə, müəllif didərginliyin niyə, nədən baş verdiyini də, onun səbəbkarını da yaxşı bilir və bunu bir bayatısında belə dilə gətirir:

Bağçada bağı neynim?
Bostanda tağı neynim?
Yurdumu viran qoydu,
Dilbilməz yağı, neynim?

Həssas şair düşmənin arxalı olduğunu bildiyindən elinin köməyinə kimsənin gəlməyəcəyini anladığından yana-yana Qaçaq Kərəmi xatırlayır:

Hamasa ağ olaydı,
Dörd yanı bağ olaydı.
Hamasadan çıxanda
Kaş Kərəm sağ olaydı.

S.Hacıyevaya 20 Yanvar faciəsi də ağır təsir etmiş, bunu o, bir bayatısında təsirli bir dillə ifadə etmişdir:

---

* Tezbahar – Ağbaba nahiyəsindəki bu kəndə 1921-ci ildə ermənilər köçürüldükdən sonra Qdaşen adlandırılmışdır.

Eləmi qara baxtım,
Gülmədi qara baxtım.
İyirmi Yanvar günündə
Qan yağan qara baxdım.

Müəllifin yaradıcılığı barədə dediklərimizə bir də qayıdaq: yəni burada dərd-kədər olduqca qara, tünd rəngdə təsvir olunur. Bunu aşağıdakı bayatıda da görmək mümkündür:

Əynimdəki kəfəndi,
Dərdlər məndən ötəndi?
Mənim dərdim sağalmaz,
Dərdə dərman vətəndi.

Gördüyümüz kimi, bu bayatı da bir az bundan öncə qeyd etdiyimiz bayatılarla səsləşməkdədir. Sadəcə, burada paltarın, libasın kəfənə oxşadılması ömrün qüruba yaxınlaşmasını əks etdirməklə dərdlərinin bitməyəcəyini göstərməkdədir, çünki "dərdə dərman vətən" düşmən tapdağı altındadır.

Maraqlıdır ki, şairin bayatılarında bölgənin etnoqrafi-yası, adət-ənənələri də işlənmişdir. İndi onun bununla bağlı iki bayatısına nəzər salaq:

Kündəm düşdü, təndir ver,
Çay süzmüşəm, qəndi ver.
Köçüm yola düzüldü,
Nolar, bizim kəndi ver.

Utan, ay fələk, utan,
Pislərdi kama çatan.
Hanı o Ağbabada
Mənsil alıb, yağ tutan.

Qeyd edək ki, sanki ikinci bayatı birincini izah edir. Yəni müəllif birincidə fələyə müraciət edib. Maraqlıdır ki, həm birinci, həm ikinci bayatıda işlənən "təndir" sözü, "mənsil alıb, yağ tutmaq" ifadəsi elə-belə, söz gəldi işlənməyib.

Bunların arxasında Ağbaba bölgəsinin zəngin etnoqrafiyası, mətbəx mədəniyyəti dayanır. Yəni, Ağbabada təndir bar-bərəkət deyilənin mərkəzi, istiliyin mənbəyi, insanların toplandığı müqəddəs yer, isti bucaq sayılırdı. Burda təkcə çörək deyil, lavaş, pişi, lalanqa, kətə, mafış, fətir, çəkməcə, xəşil, təndir kababı, ayran aşı, pazı, kartof kababı, daha nələr, nələr bişirilmirdi ki! Təndir çörəyinin iyi uzaqlara yayıldığından yoldan keçənləri evə dəvət edib onlara təndir başında isti təndir çörəyindən dürmək vermək, düymənc ovmaq adətdəndi. Hər qış vaxtı təndir başı daha şen, yığnaqlı olardı. Buna Ağbabada "təndirə sallanmaq" deyərdilər. Qaldı yağ tutmaq. Bu da elə adi iş deyildi. Ev qadınlarından bir neçəsi toplanıb xəv (dəstə) düzəldər, növbə ilə bir-birinə süd verərdilər. Bu qadınlara xəvçi, yəni "dəstə üzvü" deyirdilər. Hər bir qadın bir yerə toplanan südü maşnada çəkir, onu üzə (qaymaq), şırata (üzsüz süd) ayırırdılar. Sonralar üz nəhrədə çalxanıb kərə (şit) yağ olur, bu yağı isə qazana doldurub isti təndirin üstündə əridirdilər. Buna yağ tutmaq deyirdilər.

S.Hacıyevanın şeirləri elə çox deyil, amma sərbəst vəzndə olsa da adamı təsirləndirir. Bu poetik örnəklərdən

hiss olunur ki, müəllif olduqca həssas, yurdcanlı, dünyagörüşlü, haqqa tapınan şəxslərdəndir. Onun "Şəhidlər xiyabanı" maraqlı şeirlərdəndi. O yazır:

Qərənfillər qan yaşım,
Xiyaban daş yaddaşım,
Azadlıq son sirdaşım,
Təsəllim olur burda!

Müəllif başqa bir şeirində Xocalı faciəsini törədənləri lənətləyir, düşmən üzərində qələbə çalmamış ölməyəcəyini deyir:

Həqiqətlər hər tərəfə günəş kimi saçılsın,
Düyünlənmiş bütün düyünlər açılsın,
Mən həqiqətin qələbəsini görmədən ölə bilmərəm!

S.Hacıyevanın şeirlərində məcazlar da gen-bol işləndiyindən bu poetik örnəklər yaxşı yadda qalır, adama xoş təsir bağışlayır. Bunu daha aydın təsvir etmək üçün aşağıdakı iki nümunəyə diqqət yetirək:

Birdən qaranlığım
İlahi bir güclə nurlanır:
Qaranlığımdan sabaha
Bir ümid boylanır.

Günləri yumaq kimi
Üst-üstə sarı ha, sarı.
Könlüm çəkib özünə
Qəmnən hasarı.
Dərd anlayan,

Hal bilən
Aşa bilərmi hasarı?

Burada ümidin insan kimi boylanması, günlərin yumaq kimi təsvir olunması, üst-üstə sarılması, könülün qəm hasarı kimi ifadələr şeirlərə həm təravət, həm yeni ruh gətirmişdir.

Fikirləşdik ki, müəllifin "Belə qocalmışam" poeması haqqında bir qədər ətraflı danışmağa, bəhs etməyə dəyər.

Burada müəllif özü ilə doğmalarının arasındakı təzadları belə təsvir edir:

Həm sənə yaxın,
həm uzağam,
Qalmışam ikisinin arasında

Poemada da nəzərə çarpan deyimlər, ifadələr az deyil. Müəllif yazır:

Gündəlik qayğılar
Bir yaz yağışı kimi
Düşündüklərimi
Silib aparacaq.

Burada şairin övlad barəsində maraqlı qənaətləri, nəticələri də diqqət çəkir:

Övlad insanın
Bu günü, sabahı.
Övlad insanın
Gələcəyiymiş!

Övlad insanın başucalığı,
Övlad insanın
Barı, bəhəriymiş,
Şükür sənə Allahım!
Barlı-bərəkətli başa varmışam.

Müəllif yeri gəldikcə poemada adət-ənənələrə uyğun təsvirlərə də yer ayırmış, bunu daha çox nağıl motivlərində verməyə üstünlük vermişdir. O yazır:

Xatirələrim yunum,
Darağım, cəhrəm mənim.
Cəhrəm hərləndikcə
Xatirələr yumağa dönəcək.
Yada nələr, nələr gələcək...

Təbii ki, yun darağı, cəhrə toxuculuqla bağlı olub, Ağbaba ərazisində ev qadınlarının xüsusən payız və qış dövründə asudə vaxtlarında əsas işlərindən sayılırdı. Hər bir ev qadını həm həvəslə iş görür, həm də arada ya avazla bayatı deyir, ya da qımqımı oxuyurdular. S.Hacıyeva da folklor və etnoqrafiyaya yaxşı bələd olduğundan poeziyasında bu elementlərdən kifayət qədər bəhrələnmişdir. Bunu aşağıdakı misralarda da görməmək mümkün deyil:

Payız qabağı iməci çağırıb
Xəmir tutardım.
Əriştə kəsib, qışa yığardım...
Yaylaqdan gələn
Yağı, motalı, balı, qaymağı
Ləzzətlə yeyərdi hamı;

İndi də damağımda
Qalıbdı tamı.
Yarma, bulğur döyüb
Aşa saxlardım...
Qurut qoyub, qışa saxlardım.
Toyuq basdırardım.
Cücə saxlardım.
Heyif, gözəl günlərimdən.

Gördüyümüz kimi, burada qış ərzaqlarından, ev qadınlarının zəhmətlərindən xüsusi bir həvəslə söz açılıb bəhs olunmuşdur. Bəli, elə bu cəhətlərinə görə bu poema xüsusi maraq doğurur. Bu əsər həm də nağıl motivlərinin işlənməsinə görə də diqqətçəkicidir. İndi bu yöndə bir neçə misala nəzər salaq:

Keçmişimə çata bilmirəm.
Keçmişim yeddi dağın dalında
Yeddi dağın açarı
Yeddi divin əlində.

Gələcəyim qocalıb qalıb
Yeddi yolayrıcında.

Təbii ki, burada verilən Sindibad "Min bir gecə" nağıllarının qəhrəmanı, yeddi dağ, yeddi açar, yeddi div və yeddi yolayrıcı nağıl motivləridir, müəllif bunları ustalıqla poemada işlədib.

Burada müəllif sevgi nədir sualına da maraqlı cavab verir, o yazır:

Sevgi sizə tac olsun,
Sevgisizlər sizə
Möhtac olsun.
Sevgini sevgi ilə paylayın,
Dünyanı, bir-birinizi
Sevgi ilə qucaqlayın.

Müəllif giley-güzarlarını nə qədər izhar etsə də, ailəsinə, doğmalarına qırılmaz tellərlə bağlılığını, sədaqətini belə əks etdirir:

Dərdimi dəvə çəkə bilsə
Sarvanı sən ol istərəm.
Tale yenidən yazılsa,
Mənimki yenə də
Sən ol istərəm...
Ömürdən seçim olsa,
Mən gedim,
Sən qal istərəm.

Təbii ki, bu xitab müəllifin həyat yoldaşınadır. Bu, həm də bu şəxsin necə saf, ailəcanlı olduğunu bir daha göz önünə gətirir. Amma müəllif bununla da kifayətlənməyib öz dualarını, arzularını belə ifadə edir:

Kəhkəşana əl uzatdım
Ayı, ulduzu qəlbimə yığdım.
İşığı sənin olsun!
Günəşə qucaq açdım,
İçim nurla doldu
İstisi sənin olsun!
Külək tellərimi daradı,

Sığalı sənin olsun!
Torpaq ayaqlarımı oxşadı,
Çəməni sənin olsun!
Bütün qayğılar mənim
Sevinc dolu dünyam
Sənin olsun!

Səadət Hacıyevanın bu kitabda bir neçə xatirəsi ("Maral", "Atam haqqında bir neçə söz", "Həyatda tanıdığım ən gözəl insan") verilib. Müəllifin xatirələri də şeirləri kimi maraqlı, həm də etnoqrafik və folklor motivləri ilə az-çox işləndiyindən oxucuya xoş təsir bağışlayır. Səadət Hacıyeva birinci xatirədə atasının gəncliyində sevdiyi nakam Maralın ölüm xəbərinin anası tərəfindən də hüznlə qarşılandığını yazır: "... gözünün yaşı atamın saçını islatdı. İkisi də sakitcə ağlayırdı. Mən maraqla gözləyirdim. Bu dəfə anamın bayatısı məni də ağlatdı:

Qərib öldü, götürün,
Dar küçədən ötürün.
Qəribin öldüyünü
Sevdiyinə yetirin.

Daha sonra müəllif yazır ki, anamın bu sözləri ("atan Marala olan sevgisini ürəyində dəfn etdi") məni çox kövrəltdi, atamın məhəbbətinə doyunca ağladım. Bu xatirənin axırına yaxın Səadət Hacıyeva atasının avtobusda bir cavan kişiyə rast gəldiyini göstərir. Onun Maralın qardaşı Tariyel olduğunu deyərək atasının onu evə qonaq apardığını, anasının da qonağı hörmətlə qarşıladığını xüsusi qeyd edir.

Əlbəttə, ikinci xatirə də maraqlıdır. Müəllif atasının bəzi özünəməxsus cəhətlərini göstərir. O yazır: "Atamın

gözəl səsi vardı. Xalq mahnısı “Qaragilə”, “Kəklik” və başqalarını elə gözəl oxuyardı ki, elə bilərdin xanəndəyə qulaq asırsan. Folkloru atam da, anam da gözəl bilirdilər. Qışın uzun gecələrində söhbət gəlib o yerə çatardı ki, bir də baxardım anam nanay deyir. Həvəslə onlara qulaq asar, arada biz də onlara qoşulardıq. İndi də qardaş və bacılarım bu nanayları gözəl bilirlər”.

Səadət Hacıyevanın Ağbaba-Şörəyelin ən hörmətli ziyalılarından olan riyaziyyatçı alim, poeziya vurğunu Qasım Mustafayev haqqında qələmə aldığı xatirəsi də olduqca təsirlidir.

Təbii ki, bu dəyərli kitab haqqında çox söz demək olar. Biz sözümüzü dedik, indi də söz dəyərli oxucularındır.

**Tacir SƏMİMİ**
***filologiya üzrə fəlsəfə doktoru***

## XIDIR NƏBİ

Bayrama 40 gün qalmış Ağbaba elində "Xıdır Nəbi"ni xüsusi təmtəraqla qarşılayardılar. Bu bayram adətən fevral ayının birinci həftəsinə düşərdi. Bayramı qarşılamaq üçün ev-eşikdə təmizlik işləri və səliqə-sahman aparılardı. Dib-köşə tərtəmiz silinib süpürülərdi. Bu bayram üçün payızdan ağ buğda təmizlənib, qurudulub saxlanardı. Təndir qalanıb, ocaq çatılardı. Saxlanılan buğda ocaqda, sacda qovrulardı. Qovurğanı kirkirədə çəkib qovut eliyərdilər. Ələkdən, daşqırdan keçirib qovudun yarmasını ayırardılar. Ununu (qovudunu) sarı yağla, südlə, şəkərlə çalıb qarlı qışın uzun gecələrində nağıllı söhbətlər zamanı həvəslə yeyərdilər, yarmasını isə Xıdır Nəbi bayramı günü təndir qalayıb xaşıl asardılar. Xaşılı sarı mayıs yağı, qurut və ya qatıqla yeyərdilər. Həmin gün bütün evlərdə adətə görə xaşıl bişirərdilər. Gənc qızlar, oğlanlar həmin xaşıldan çörəyin üstünə qoyub eşikdə ot tayasının, ya örtmənin üstünə qoyub gizlənərdilər. Sərçələr hər kəsin xaşılını dimdiyinə alıb hansı tərəfə uçsa, demək, həmin gənc o tərəfdən qız alar, qız isə həmin tərəfə gəlin köçərdi. Bu, dədə-babadan sınanmış adətdir. Həmişə gerçək olur. Xəşil bişən günün axşamı nənələr evlərdə un anbarlarının, yağ küpələrinin, qovurma qazanlarının ağzını açıq qoyardılar. Hazırladıqları qovutdan su və otla birlikdə hoylunun (dəhlizin) görünən yerinə qoyardılar. Həmin günü mütləq hava pozular, qar-çovğun olardı. "Birdən Xıdır Nəbi bizdən keçər, özü də, atı da ac-susuz qalmasın" – deyərdilər. Səhər duran kimi qovutda, suda, qovurmada, un anbarında, yağ küpəsində Xıdır Nəbinin əl, ayaq izlərini axtarardılar. Deyilənə görə,

onun əli, atının ayağı dəyən yer bərəkətli olar, nemətlər tükənmək bilməzmiş.

Bayram axşamı cavan qızlar, oğlanlar duzlu kökə yeyər, su içmədən yatardılar. Gecə hər kəsin qisməti kim isə, onu yuxuda görərdilər.

Bayram günü nişanlı qızlara oğlan evindən, təzə gəlinlərə isə ata evindən xonça gələrdi. Bu xonça digərlərindən fərqlənərdi. Xonçanı bala qatılmış qovurğa, kişmiş, qoz, fındıq, zəyrək, küncüt və s. ilə düzəldərdilər. Sininin içində yastılanıb düzəldilmiş qovurğanı müxtəlif hədiyyələrlə birlikdə aparardılar. Qonaq qəbul eləyən evdə xüsusi süfrə açılar, heyvan kəsilərdi. Qız-gəlini hörmətlə qəbul eləyib yola salardılar. Ev yiyəsi hədiyyə gətirən hər nəfərə naxışlarla bəzənmiş, əl ilə toxunmuş corab bağışlayardı. Beləcə, 2-3 gün bütün kəndin nişanlı qızlarının və təzə gəlinlərin evlərində şənlik, şadyanalıq olardı. Sonra çərşənbələr başlanardı.

Xıdır Nəbi bayramı ilə əlaqədar olaraq qəribə söhbətlər, əhvalatlar danışardılar. Bəziləri deyərdi ki, Xıdır Nəbi bizə düşmür. Yəni onlar xaşıl qazanı asmazdılar. Niyə? Deyilənə görə, nə vaxtsa filankəsin nənəsi təndirə xaşıl asanda tələsdiyindən qazanın altına xəçirgət yerinə ağac qoyur. Qazan qaynamağa başlayanda altındakı xəçirgət əvəzi qoyulan ağac yanır və qazan təndirə düşür. Buna qazan neyləsin? Xıdır Nəbi neyləsin?

Bu bayramla əlaqədar anam bir əhvalat danışardı:

– Gənc vaxtlarında çox gözəl rəfiqəsi varmış. Ona hamı, hər yerdən elçi düşür. Deyirlər, bu gün nişanlanar, sabah nişanlanar. Xaşıl bişən günü anamın rəfiqəsi də ot tayasının üstünə xaşıl qoyub hansı tərəfə gəlin köçəcəyini görmək istəyir. Anam deyirdi ki, yazıq qızın bəxti

gətirmədi. Quş onun xəşilini dimdiyinə vurub qəbristanlığa uçdu. Bir müddət sonra rəfiqəsi gözlənilmədən xəstələnir. Gəlin köçmək yerinə qəbiristanlığa köçür. Mən də məhəllədəki qızlarla bu bayramda bəxtimi sınamışam, çox düz olduğunun şahidi olmuşam.

## QIZLAR BAYRAMI

Axır çərşənbə yeddi ləvin adlanardı. Süfrədə mütləq yeddi rəngdə şirniyyat olardı. Axır çərşənbədə Ağbabada "Qızlar bayramı" deyilən şənlik keçirilərdi. Axır çərşənbədən əvvəl qızlar bilərdilər ki, bayramı kimin evində keçirəcəklər. Bunu adətən hamı bilərdi. Bu şənlik nişanlı qızın evində keçirilərdi. Kəndin bütün gənc qızları bir gün əvvəl bu evə yığışardılar. Səliqə-səhmana kömək edərdilər. Sabahkı şənlik üçün hərə evindən bir şey gətirərdi ki, bayram süfrəsində hər şey olsun. Axır çərşənbə günü şər qarışmamış kəndin bütün gənc qızları bu evə yığışardılar. Şənlik başlanardı. Əsl şənlik isə yemək süfrəsindən sonra olardı. Qızlar halay çəkib "çeçələ barmaq" oynaya-oynaya, iki-iki bir-biri ilə deyişərdilər. Bu və bu kimi nanayarasını musiqini dəyişə-dəyişə xorla oxuyardılar. Beləcə nanay deyib deyişərdilər. Elə ki dincəlmək istədilər, qapı dinləməyə, qulaq falına çıxardılar. Hər kəs eşitdiyini çalışardı ki, xeyirə yozsun. Buna "qapı pusma" deyirdilər. Əsl şənlik qapı pusmadan sonra başlanardı. Bir neçə qız yığışıb kənd bulağından su gətirməyə gedərdi. Suyu iynə salaraq fal açmaq üçün gətirdiklərinə görə gedib qayıdan zaman danışmaq olmazdı. Bu suya "lal su" deyirdilər. Gətirdikləri suyu bir ləyənə

tökərdilər. Qızlar halay vurub ləyənin ətrafında oturardılar. Xam iynə və xam pambıq (yəni işlənməmiş) götürərdilər. İynənin sap keçən ucuna azca pambıq eşib yapışdırardılar. Bu cür iki iynə hazırlanardı. Sonra iynələrdən birini qızlardan birinin adı ilə suya salardılar. Hərəsi ləyənin bir tərəfində olan iynələri pambıq suyun üzərində saxlayardı. Sonra nanaylar başlayardı:

Ayın, ilin axırı,
Yüklə gəlsin taxılı.
Qorxma, ürəksiz oğlan,
Qız sənindi axırı.

Sarıma qurban, sarıma qurban,
Sarı köynəkli yarıma qurban.

Arpa biçdim az qaldı,
Taxıl biçdim saz qaldı.
Qorxma, ürəksiz gözəl,
Qovuşmağa az qaldı.

Beləcə oxumağa davam edərdilər, ta ki, iynələr bir-birinə yaxınlaşıb qoşa durana qədər. Əgər iynələr qoşalaşırdısa, deməli, həmin qızla oğlan qovuşacaq. Bəzən iynələr suya batardı. Bu da o demək idi ki, həmin qızla oğlanın bəxti bir deyil.

Sonra üzük falı açardılar. “Lal” suyu ləyənə töküb üstünə altı göstərməyən qırmızı örtük atardılar. Hərə öz üzüyünü niyyət edib suya atardı. Ləyənin üstü örtüləndən sonra ləyənin qırağında üzüyü çıxarmaq üçün balaca qız uşağı oturardı. Sonra yenə nanay oxuyardılar. Hər benddən sonra qız örtünün altından üzükləri qarışdırar və birini çıxarardı. Oxunan bayatını üzük sahibinin falına yozardılar.

Beləcə dan sökülənə qədər qızlar oynayar, əylənərdilər. Dan söküləndə kənd bulağına gedib sulaşardılar. Sonra hərə öz evinə təzə su aparardı. Suyun içində mütləq yeddi dənə balaca çay daşı olardı. Bu daşları növbəti axır çərşənbəyə qədər evin müxtəlif yerlərinə qoyardılar. Gətirdikləri təzə su ilə evin sakinlərini sulayar, bayramlaşardılar. Günəş görünəndə sulaşma dayanardı. Bu vaxt bütün kənd evlərinin həyətindən, damından yanan bayram tonqallarının alovunun ərşə dayandığı görünərdi. Bu isə o demək idi ki, kənddə bayram şənlikləri başlandı.

## QURBAN BAYRAMI

Yadımdadır ki, kənddə anam doğulan ilk erkək quzunu “qurban” adlandırardı. Ona xüsusi qayğı və sevgi göstərərdi. Arpanı ovcunda yedirdərdi. Hər gün tumarlayar, təmiz saxlayardı. Quzu anama o qədər alışardı ki, anam hara getsə dalınca gedərdi. Hər kəsi kəllə ilə vurmağa çalışardı. Nənəm buna çox hirslənər, anamın dalınca danışardı ki, quzunu pis öyrədir. Qurbanlığa bir-iki gün qalmış anam quzunun alnına xına yaxardı. Qurban kəsilən gün quzuya dua oxunmuş duz yaladardı. Qurban kəsiləndən sonra azı yeddi qapıya pay göndərərdi. qurbanı ehtiyacı olanlara, qurban kəsməyənlərə paylayardı. Payı külfətin sayına görə qoyardı ki, evdə hamı ət yeyə bilsin. Hər qurban bayramında nənəm bizə İbrahim peyğəmbərlə İsmayılın əhvalatını danışardı. Bu qurbanı İsmayıl qurbanı adlandırardı.

Kənddə nişanlı qızlara oğlan evindən, təzə gəlinlərə ata evindən bəzədilmiş qoç göndərərdilər. Dəstə-dəstə qız

gəlinlər əli xonçalı nişanlı qız evinə, təzə gəlin evinə bayramlaşmağa gedərdilər. Xüsusi süfrə açılar, gələnləri təm-təraqla qarşılayar, hörmətlə yola salardılar.

## RAMAZAN BAYRAMI

Gözümüzü açandan nənəmi oruc tutan görmüşdük. Oruc olan zaman anam nənəmə xüsusi qulluq edərdi. Axşam iftar zamanı göydə ulduz görməsə, nənəm süfrəyə oturmazdı. Qədr gecələrində bizə oruc tutdurar, iftara isə ən yaxşı yeməkləri bişirtdirərdi. Oruc tutduğumuza görə bizə hədiyyələr alardı. Ramazanın axırıncı günü evə molla gətirdər, Quran oxutdurar, tutduğumuz orucu rəhmətlik babamıza hədiyyə etdirərdi. Bayramdan bir gün əvvəl bütün evlərdə bişi bişirər, bütün kənd əhli qəbiristanlığa ziyarətə gedərdilər. Quran (Yasin) oxutdurar, hər kəs öz ölüsünü ziyarət edərdi. Sonra hamı qəbiristanlığın kənarına çəkilib dövrə vurub oturardılar. Gətirdikləri bişilərdən bir-birinə paylayar, yeyər və söhbətləşərdilər. Bu mərasim "namazlıq" adlanardı. Ramazan bayramı günü evimizdə xüsusi gəl-get olardı. Anam yaxşı yeməklər bişirər, xususi hazırlıq görərdi. Nənəmin bayramını təbrik eləmək üçün bibilərim, əmilərim, dayılarım, qonşular bizə yığışardılar. Yeməkdən sonra olub-keçənlərdən şirin-şirin danışardılar.

## TOY MƏRASİMİ

Əgər oğlan öz kəndlərindən, ya qonşu kənddən qız bəyənibsə bacısına, bacısı anasına, anası isə atasına deyərdi. Bir gecə ata qohum-əqrəbadan ağsaqqalları, sözü keçənləri evinə dəvət eliyərdi. Məsələni açardılar. Hər kəs qızın kimliyi ilə maraqlanardı. Kimlərdəndi, əsli-nəsli kimdi – deyərdilər. Hətta misal çəkərdilər.

Gözəl alma...
Yeməyə gözəl alma.
Çirkin al, əsil olsun,
Bədəsil gözəl alma.

Ata əlaltından yetikləşdiklərini, uyğun olduğunu söyləyər, elçi getməyə gün təyin eliyərdilər. Elçilikdə kimlərin iştirak edəcəyini dəqiqləşdirərdilər. Söhbət qız evinə çatardı. Elçiləri hörmətlə qarşılayardılar. Söhbət açılar, məqsəd söylənərdi. Qız evindən elçiləri, – biz də məsləhətləşək, sizi soraqlaşaq, xəbər göndərərik, – deyə yola salardılar. Üçüncü elçilikdə "hə" verilər, şirin çay içilər, nişan günü təyin olunardı. Oğlan evindən qız evinə boynuna qırmızı kəlağayı bağlanmış ətlik heyvan (buna ağəmmət deyərdilər) göndərərdilər. Onu gətirənə qız evi xələt (hədiyyə) verərdi. Oğlan evinə nişana dəvət edilmiş adamlar yığışardı. Oğlanın anası hazırlanmış xonçaları paylaşdırar, kimin nəyi aparacağını söyləyərdi. Xonçalar böyük mis sinilərdə bəzədilərdi. Qohum-əqrabanın hədiyyələri də xonçalara qoyular, üstü qırmızı kəlağayılar ilə örtülərdi.

Qız evində xüsusi hazırlıq görülərdi. Oğlan evindən xonça gətirənlərə hədiyyələr verilərdi. Oğlan tərəfindən gələnləri "qazanaçdıya" dəvət edərdilər. Ocaq başında xüsusi həvəslə xaşlama bişirənə hər kəs 5-10 manat verməklə zəhmətini qiymətləndirər, yeməyin dadına, duzuna baxıb sonra məclisə keçərdilər. Bəzənmiş süfrələrin arxasında oturardılar. Qız yengəsi qızı bəzəyib məclisə gətirər, oğlan tərəfindən gələn ağsaqqalardan biri qızın barmağına nişan üzüyünü taxar, başqa biri isə qırmızı örtünü qızın başına salardı. Digər qonaqlar "boy gördüsü" – deyə yengəyə pul verərdilər. Yengə qızı məclisdən götürdükdən sonra şənlik başlayardı. Səsi gözəl olanları hamı tanıyardı. Məclisdə həmin adamları xahişlə kimlərinsə şərəfinə oxudardılar. Bu hörmət hesab olunardı. Kişilərin məclisində qadınlar oturmazdı. Qadınların məclisində xonçalar açılar, gətirilənlər göstərilərdi. Beləcə məclis gecə yarısına qədər davam edərdi. Nişandan sonra qız evi oğlan evinə "xonça qaytardı" üçün hədiyyələr və şirniyyatlar hazırlayar, qız yengəsi ilə göndərərdilər. Bundan sonra toya hazırlıq başlanardı.

Qız evi yun yuyar, qonşular köməyə gələr, yorğan-döşək salar, yaşlı qadınlar isə toyda gələcək "atlılar" (kişi qonaqlar) üçün naxışlı corablar toxuyub hazırlayardılar. Adətən toylar ən çox payıza təyin olunardı. Əkin-biçin bitər, qış hazırlığı sona çatar, mal-qara ətini tutardı. Sonra kənddə toylar başlayardı. Toyun vaxtı təyin olunardı. Həmin vaxtdan bir neçə gün əvvəl oğlan evindən qız evinə "kəsim"ə gələrdilər. Kəsimi adətən ağsaqqallar edərdi. Kəsimdə oğlan evindən qız evinə veriləcək ətlik heyvan və xərclik danışılar, razılığa gəlinərdi. Toydan bir gün əvvəl

“ağammət” göndərilərdi. Ətlik heyvanın boynuna qırmızı kəlağayı bağlayardılar.

Toydan xeyli əvvəl oğlana və qıza “sağdış, soldış” tutulardı. Qızın “sağdış, soldış”larına toy bacıları deyərdilər. Qız toy bacıları ilə birlikdə hər axşam bir qohumun evində qonaqlanar, başına qız-gəlin yığılardı. Hər qonaqlıqda qıza cehizinə qoymaq üçün hədiyyələr verilərdi. Beləcə qız bütün qohum-əqrəbanın evində qırx gün qonaqlanardı. Toydan bir neçə gün əvvəl “paltar kəsdi” olardı. Oğlan evindən qız evinə hədiyyələrlə, şirniyyatlarla dolu xonçalar gələrdi. “Paltarüstü” adlanan bu məclis qız-gəlin yığıncağı olardı. Məclis qurular, yeyib-içib şənlənərdilər. Sonra gəlin olacaq qızı oturdub başının üstündə bir paltarlıq parçanı kəsmək üçün açardılar. “Qayçı kəsmir” – deyən oğlan yengəsi qız yengəsindən hədiyyə alardı. Sonra xonçalar açılar, bir-bir məclisdəkilərə göstərilərdi. Xonçalardakı oğlan evinin gəlinə aldıqları geyim və ziynət əşyaları olardı. Oğlan evindən xonça gətirən qız-gəlinlər qız anasından hədiyyə almadan xonçaları yerə qoymazdılar. Qız anasının verdiyi hədiyyələr rəngbərəng baş yaylıqları, yaxud bəzəkli corablar olardı. Oğlan evindən qız anasına “süd haqqı” deyilən qiymətli hədiyyə verilərdi.

Toydan bir gün əvvəl qız evində “xınayaxdı” olardı. Gündüzdən qız yengəsi adam göndərib kəndin gənc qız-gəlinlərini axşamkı xınayaxdıya dəvət eliyərdi. Hər kəs evində işlərini rahlayıb, axşam bəzənib-düzənib xınayaxdıya gedərdi. Oğlan evindən qız-gəlin xına xonçası gətirərdi. Qız evində məclis qurular, yeyib-içib şənlənərdilər. Yallı gedib, nanay deyərdilər. Qız evi ilə oğlan evi bir-birilə deyişərdi. Sonra xınayaxma məclisi başlayardı. Bir stul ortaya qoyulardı. Stulun altına bir stəkanda su və

içində bir yumurta qoyulardı. Toyu olan qızı həmin stulda oturdardılar. Qızın əllərini başının üzərində bir-birinin içinə qoyardılar. Qızın başı üzərində açıq qalan ovcuna oğlan yengəsi isladılmış xına qoyardı. Qabaqdan öyrədilmiş beş altı yaşlı oğlan uşağı gəlinin ovcundakı xınaya barmağını batırıb qaçardı. Nanay oxuya-oxuya gəlinin əlinə və ayağına xına yaxılardı.

Çıxdım aya baxmağa,
Qapıya kilid taxmağa.
Oğlan xına göndərib,
Qız əlinə yaxmağa.

Oğlanın bacısı nanayı dəyişdirərdi:

Ayaz yıldızım, ay qız,
Bəyaz yıldızım, ay qız.
Gəl alım qardaşıma,
Olum baldızın, ay qız.

Al almağa gəlmişik,
Şal almağa gəlmişik,
Oğlanın adamıyıq,
Qız almağa gəlmişik.

Nanay nanayın bəndi,
Nanay bürüdü kəndi.
Pul verib satın allam,
Yarım oturan kəndi.

Və s. beləcə yaxılan xına quruyanadək qızlar iki-iki, üç-üç olub sırayla nanay arasını dəyişərək oxuyardılar. Toyu olacaq qızın əlinin xınasını yumazdılar, quruyandan sonra yağ sürtüb ovardılar. Bu vaxt qızın dili ilə qızlar oxuyardılar:

Lampadakı boyağam,
Yatmamışam, oyağam.
Anama xəbər verin,
Bir gecəlik qonağam.

Ana, məni al eylə,
Al belində sal eylə.
Gedirəm, yol üstəyəm,
Duz-çörək halal eylə.

Belə sözlər oxumaqla ananı və balanı kövrəldərdilər. Səhər günortaya yaxın oğlan evi başlarının yığnağı ilə çalıb oynaya-oynaya toyçuları qız evinə gətirərdilər. Qız evindən bir nəfər gəlin çalğıçılarla birlikdə qara zurnanın və nağaranın sədaları altında kənddəki təzə gəlinləri bir-bir toya, toy evinə gətirərdilər. Sonra qız evinin həyətində toy şənliyi başlanardı. Bir tərəfdə qazanlar ocaq, təndir üstünə asılardı. Yeməklər bişirilər, axşamkı məclisə hazırlıq gedərdi. Digər tərəfdə nağaranın, zurnanın səsi kəndi başına götürər, dağı-daşı dilə gətirərdi. Şənlik gecə yarısını keçənədək davam edərdi. Qız toyu qurtarardı. Səhər çalğıçılar oğlan evində olardılar. Gəlin köçürməyə getmək üçün qız-gəlinlər, qohum-əqrəbalar oğlan evinə yığışardılar. Həmin gün qız axırıncı qonaqlıq üçün sağdışın evində olardı. Qızın başına toplaşan qız tərəfinin qız-

gəlinləri çalğıçılar qızın dalınca gələnədək çalıb-oynayar, yeyib-içib əylənərdilər. Çalğıçılarla qızın dalınca gələnlər görərdilər ki, sağdış və soldış əllərində yanan şamlarla gəlin qızı aralarına alıblar. Oğlanın atası – qaynata sağdışa və soldışa xələt (hədiyyə) verib şamları alar və öz tərəflərindəki qızlara verərdi. Qızlar gəlini aralarına alıb musiqinin müşayiəti ilə qız evinə gətirərdilər. Qız evində başbəzəyi başlanardı. Bunu yengələr eliyərdilər. Yengələr həmişə başıbütöv oğullu-qızlı olanlardan seçilərdilər. Bu ərəfədə qızın cehizi maşınlara yüklənərdi. Gəlin geyinib bəzənənə qədər qız-gəlin yenə nanaylar oxuyardılar. Oxuduqları mərasimə uyğun olardı. Sonra gəlinin saçının qabağından bir-iki tel kəsib elə öz qoynuna atardılar. Qız yengəsi əlində güzgü gəlinin arxasında durar, bir əlində də müjdə yastığı tutardı. Gəlin hazır olandan sonra atası onu təndirin başına dolandırar, sonra əllərinə pul bağlayardı. Sonra gəlinin qardaşı qızın belinə kəmər bağlayardı. Oğlanın atası bu işinə görə qızın qardaşına qiymətli saat bağışlayardı. Oğlan yengəsi qız evindən "acı xəmir" (maya) götürərdi ki, oğlan evində bu xəmiri çörəyə qatıb bişirərdilər. Bu, qızın getdiyi yerdə çörəkli olması, ev adamlarına qaynayıb qarışması üçün idi. Qız-gəlinlər oğlan evinə çatanda qız evindən götürdükləri boşqabı sındırardılar ki, göz dəyməsin. Qızın əmisi, dayısı, qohumları da qızın ovcuna pul qoyardılar. Bunlar bitəndən sonra oğlan evi gəlini aparmaq üçün otağa daxil olmaq istədikdə qız tərəfdən "qapı basdı" istəyərdilər. Qızı aparmağa gələn oğlan tərəfinin adamlarına "atdı" deyərdilər. Onlar üçün süfrə açılar, toxunma corablardan hədiyyə verilərdi. Gənc oğlanlar bu "atdı"ların papaqlarını qaçırıb, əvəzinə pul alıb papaqları qaytarardılar. Gəlin

karvanı yola düzülərdi. Qabaqda qaynata, ya əmi, ya dayı gedərdi ki, yolu kəsənlərə peşkəş versin. Qız yengəsinin hazırladığı “müjdə yastığı”nı götürüb qaçan oğlan evinə tez çatmağa çalışar, yastığı qaynanaya verib muştuluq alardı. Gəlin karvanı oğlan evinə çatmamış münasib yerdə dayanıb dincələr, yallı gedər, qız evindən hazırlanan halva-lavaşı paylaşdırıb yeyər, təkrar yolarına davam eliyərdilər. Gəlin oğlan evinə çatanda gəlinin mindiyi maşının sürücüsü “xələt” almamış qapını açmazdı. Oğlan öz sağdış və soldışı ilə evin damına çıxıb gəlinin başına şirnilər və alma atardı. Gəlin içəri girməmiş qapının ağzına ağzıüstə mis qazan və onun üstünə saxsı qab qoyardılar. Gəlin qabağında kəsilən qurbanın üstündən keçəndən sonra qazanın üstündəki qabı ayağı ilə vurub sındırardı. Sonra gəlin içəri keçərdi. Astanadan içəriyə doğru yerə süfrə salıb üstünə bir-birinin dalınca yeddi lavaş, onun üstünə də qənd düzərdilər. Gəlin bu lavaşları sağ əli ilə götürüb sol qolunun üstünə yığar, qəndi isə başının üstündən arxasına atardı. Lavaşları gətirib yuxarı qoyardı. Qız yengəsi gəlin oturmur deyə, qaynata-qaynananı çağırardı. Onlar gəlinə peşkəş verib oturdardılar. Bu zaman oğlan evindən gəlinin qucağına oğlan uşağı otuzdurardılar. Qız yengəsi bu uşağa xələt verərdi. Bayırda cehizin üstündə gələn adama xələt verib cehizi içəri daşıyardılar. İçərdə isə gəlinin tərifi başlanardı. Bu tərifi zurnanın müşayiəti ilə hörmətli qadınlar deyərdilər:

Gəlin deyər hanı atam?
Qoçum yoxdu, qoyuna qatam.
Qaynatan da sənin atan,
Gəlin, xoş gəldin, xoş gəldin,
Bizim oğlana tuş gəldin.

Gəlin deyər hanı anam?
Əlimdən aldılar sonam.
Qaynanan da sənin anan.
Gəlin, xoş gəldin, xoş gəldin,
Sonam, xoş gəldin, xoş gəldin.

Gəlin deyər hanı qardaşım?
Qarlı dağlar necə aşım?
Qaynın da sənin qardaşın
Gəlin, xoş gəldin, xoş gəldin,
Anam, xoş gəldin, xoş gəldin.

Gəlin deyər hanı bacım?
Başımdan aldılar tacım.
Baldızın da sənin bacın.
Gəlin, xoş gəldin, xoş gəldin,
Sonam xoş gəldin, xoş gəldin.

Gəlin deyər hanı əmim?
Dəryalarda qaldı gəmim.
Oğlanın əmisi sənin əmin.
Gəlin, xoş gəldin, xoş gəldin,
Anam, xoş gəldin, xoş gəldin.

Gəlin deyər hanı dayım?
Gecikməsin mənim payım.
Oğlanın dayısı sənin dayın.
Gəlin, xoş gəldin, xoş gəldin,
Bizim oğlana tuş gəldin.

Gəlin deyər hanı bibim?
Məkkədi mənim pirim.
Oğlanın bibisi sənin bibin.
Gəlin, xoş gəldin, xoş gəldin,
Sonam, xoş gəldin, xoş gəldin.

Gəlin deyər hanı xalam?
Dağ döşündə qaldı lalam
Oğlanın xalası sənin xalan.
Gəlin, xoş gəldin, xoş gəldin,
Anam, xoş gəldin, xoş gəldin.

Uzun küçə yolun olsun,
Zər-zibadan donun olsun.
Bizim oğlan yarın olsun,
Anam, xoş gəldin, xoş gəldin,
Gəlin, xoş gəldin, xoş gəldin.

Bacadan baxdım işıqdı,
Ləngəri dolu qaşıqdı.
Gəlin evə yaraşıqdı,
Gəlin, xoş gəldin, xoş gəldin,
Sonam, xoş gəldin, xoş gəldin.

Hazar-hazardı bu gecə,
Dükan bazardı bu gecə.
Gəlinin qaloşunu gətirin,
Bəy intizardı bu gecə,
Gəlin, xoş gəldin, xoş gəldin,
Bizim oğlana tuş gəldin, tuş gəldin.

Bu bənd xüsusi ilə zarafat üçün oxunardı.

Küçələri palçıqlıdı,
Çörəkləri qılçıqlıdı.
Qaynananı dindirməyin,
Yeyən artıb, acıqlıdı.
Gəlin, xoş gəldin, xoş gəldin,
Anam, xoş gəldin, xoş gəldin.

Tərif deyilən zaman adamların öz adlarını deyirdilər. Zurnanın müşayiəti ilə oxunan bu tərif zamanı qadınlardan biri qırmızı örtülmüş məcməyini əlində oynadaraq peşkəş yığardı. Bu peşkəşi tərif deyən qadınlar zurnaçı ilə bölüşdürərdilər. Tərifdən sonra qız yengəsi çamadanından "gərdək" (rəmzi naxışlarla bəzənmiş qırmızı örtük) çıxarırdı. Asmaq üçün mıx, çəkic istəyərdi. Oğlanın anasını, qohumlarını çağıraraq: "gərdəyin ipi çatmır" – deyərək yengə peşkəşini alandan sonra gərdəyi asardı. Gəlini gərdəyin dalında oturdardılar. Bu mərasim bitdikdən sonra məclis başlanardı. Məclisdən çıxanlar: bütün kənd camaatı toy damına (toyxana) yığışardı. Zurnanın, sazın, sözün səsi aləmi başına götürərdi. Filankəsin xahişi ilə filankəslər filan qaydanı (havanı) oynamaq üçün meydana dəvət olunardı. Rəqs meydanını idarə eləyənə "toy babası" deyərdilər. Toyun sonuna yaxın gəlini meydana gətirər, başına qırmızı kəlağayı atar, ən hörmətli ailələrin təzə gəlinləri ilə rəqsə dəvət eliyərdilər.

Toyun sonunda "şah" gətirmək üçün lopalar yandıraraq oğlanın sağdışının evinə zurna-balabanla çalıb oynaya-oynaya gedərdilər. Sağdışın – yəni bəyə qardaş olanın evində süfrə açılar, "şah" dalınca gələnlərə qulluq

olunardı. Sonra qız yengəsinin gətirdiyi köynəklə corablar bəyə, sağdış və soldışa hədiyyə olunardı. “Şah”ı götürüb çalıb oynaya-oynaya gətirib gəlinin otağına qoyardılar. Qız yengəsinin gətirdiyi “döşqarı” (bozartma) və başqa yeməli şeylər gəlinin otağında süfrəyə düzülər, bəylə gəlin üçün hazırlanardı. Beləcə toy qurtarardı. Toydan 2-3 gün sonra qadınların “gəlini üzəçıxarma” mərasimi olardı. Gəlinə qaynanası və anası tərəfindən qiymətli hədiyyə bağışlanardı. Sonrakı günlərdə oğlan evi qız evinin qohum-əqrəbasını qonaq dəvət eliyərdi. Gözəl məclis qurulardı. Bu məclisdə oğlanın qohumları da iştirak edərdilər.

## ALQIŞLAR

Ağ əppək yeyib, ağ gün görəsən.
Doğduğun oğlan, doğradığın quyruq olsun.
Dədən sağ olsun.
Neynim, necə eliyim demiyəsən.
Bir əlin yağda, bir əlin balda olsun.
Tay-tuşundan seçilmiyəsən.
Dilin uzun, başın uca olsun.
Adın elnən bir, (olsun), sözün dilnən bir olsun.
Düşmən çəpəri olasan.
Elinə arxa olasan.
Təhnən çörəkli, təndirin əppəkli olsun.
Təndirin yansın, tüstün tütsün, itin hürsün.
Yarıyanlardan olasan.
Qoşa qarıyasan, bir yastıqda qocalasan.
Xəcalətli olmayasan.
Allah səni yarıyanlardan eləsin.
Allah nə diləyin varsa versin.
Elinə arxalanan dağ olar.
Ağ qoy, qızıl ovucla.
Ağ günlü, ağ yaylaqlı ol.
İtin hürsün, tüstün tütsün.
Səni görüm neylim, necə eliyim demiyəsən.
Ağ baxtlı, ağ yığvallı olasan.
Sinəndə ağ tüklər bitsin.
Balan gözünə çırağ olsun.
Balalarından yarıyasan.
Axırın xeyir olsun.
Başın dövlətli, yanın övladlı olsun.
Qazancınız bol olsun, dibiniz dolu olsun.
Əlləriniz dərd görməsin.
Qazancınız çox olsun.

## QARĞIŞLAR
## (Bəddualar)

Səni görüm dizin dəlinsin.
Zamananız zanqıldasın.
Günün dalınnan doğsun.
Qoxun kəsilsin.
Gün üzü görməyəsən.
Üzün qara olsun.
Qara gərdəkli olasan.
Qulağına yüyücü barmağı girsin.
Atdar tərkində həlak olasan, xəbərini quşlar gətirsin.
Ağ gün görmüyəsən.
Səni görüm zəlil, xəcil olasan.
Ağartı deyəndə quşların dalınca qaçasan.
Xoşbəxtlik atlı, sən piyada olasan.
Külün göyə sovrulsun.
Sən ki məni yandırdın, elə yanasan, cızdağın çıxsın!
Allahın bəlası sənnən olsun.
Bala üzünə həsrət qalasan.
Bala dadı görmüyəsən.
Səni görüm nənni asıb, beşik yırğalamayasan.
Qarnın dolu, yanın boş olsun.
Bala deyəndə dodağın qırx yerdən partlasın.
Namərdi namərd yerdə doğransın.
İlim ilim itəsən.
Qulağına yüyücü barmağı girsin.

# NAĞIL

## MƏMMƏDİYƏNİN NAĞILI

Biri vardı, biri yoxdu, Məmmədiyə adlı bir kişi vardı. Bunun ağıldan yüngül, amma göyçək bir arvadı vardı. Məmmədiyə nə desə arvadı gah düz, gah da tərsinə eliyərdi. Ona görə də Məmmədiyə tez-tez ona hirslənərdi. Bir dəfə də təngə gələn Məmmədiyə arvadını evdən qovur. Yazıq arvad hara gedəcək, gedəsi yerimi var?

Gedib həyətin o biri başındakı ot tayasının içində oturur. Gözləyir ki, əri nə vaxt gəlib onu evə aparacaq. Bir az keçir, iki az keçir, Məmmədiyə gəlmir ki, gəlmir. Bir də baxır ki, pişik miyoldaya-miyoldaya bunun yanına gəlir. Deyir:

– Bilirəm, Məmmədiyə mənim dalımca səni göndərib. Mıy-mıy bacı, üz vurma, gedən deyiləm.

Pişik çıxıb gedir. Bir az keçir, it ot tayasına yaxınlaşır. Arvad deyir:

– Ham-ham bacı, indi də sənimi yolladı. Getmiyəcəm. Məmmədiyə mıy-mıyı da yollamışdı, getmədim. Zəhmət çəkib özü gələr, onda evə dönərəm.

Gözləyir, gözləyir, axşam olur. Məmmədiyə gəlmir ki, gəlmir. Arvad bir də baxır ki, üstü yüklü bir dəvə ot tayasına yaxınlaşıb ot yeməyə başlayır. Deyir:

– Hə, ləngər yerişdi, ləvərə dodaq, Məmmədiyə indi də səni dalımca göndərib? Mıy-mıy gəldi, getmədim. Ham-ham gəldi, getmədim.

Qaranlıq düşdüyünü görüb qorxur:

– Daha sənsən da, sənin xətrini yerə sala bilmərəm.

Dəvənin yüyənindən tutub evə gedir. Məmmədiyə görür ki, budu, arvadı yüklü bir dəvəynən gəlir. Arvadı Məmmədiyəyə deyir:

– A kişi, mıy-mıyı göndərdin, gəlmədim. Ham-hamı göndərdin, gəlmədim. Amma ləngər yerişli, ləvərə dodaqlının xətrini qıra bilmədim.

Kişi tez arvadını içəri aparır. Bilir ki, arvadı doludan qorxur. Deyir:

– Arvad, möhkəm dolu yağacaq. Gəl sən təndirdə gizlən.

Arvad təndirə girir. Kişi sacı təndirin ağzına qoyur. İçinə dən səpib toyuq-cücəni çağırır. Toyuqlar saca dimdik vurub dən yedikcə arvad elə bilir doludu. Daha da qorxub əlləri ilə başını tutur. Bu müddətdə kişi dəvənin yükünü gizlədir, özünü də kəsir, bir az bişirir, qalan əti gizlədir. Sonra arvadı təndirdən çıxardır.

Sənə kimdən deyim, nədən danışım. Demə bu dəvə şahın karvanından ayrı düşüb, azıb. Yükü isə qızıl və zər-ziba imiş. Haray salırlar, axtarırlar, gördüm deyən olmur. Dəvə nədi, heç qığını da görmədim – məsəli yəqin burdan qalıb. Şahın çox ağıllı vəziri varmış. Onun məsləhəti ilə bir nəfər qapı-qapı gəzir və deyir:

– Arvadım bərk xəstədi. Həkim dəvə ətini dərman deyib. Kimdə varsa, bir qab versə savab qazanar.

Məmmədiyənin arvadı qaçıb bir qab ət gətirir. Ətin əvəzində kişi ona çoxlu rəngbərəng muncuq verib gedir. Arvad muncuqları qapıya-bacaya asıb hər tərəfi bəzəyir. Məmmədiyə işdən gələndə görür ki, hər tərəf muncuqla bəzədilib:

– Bu nə işdi, – deyə arvadından soruşur:

Arvadı deyir:

– Bir qab ət verdim, bunları aldım.

Məmmədiyə o dəqiqə bilir ki, əti aparan şahın adamıdı. İndicə gəlib onu aparacaqlar. Doğrudan da, əlini süfrəyə aparmamış şahın adamları gəlir. Məmmədiyəni apardıqları zamanı o, qışqırıb arvadına deyir:

– Arvad, mən getdim, qapı-baca amanatı.

Beləcə, Məmmədiyəni tutub aparırlar. Məmmədiyə dəvə görmədiyini, ətin dana əti olduğunu, arvadının dəli olduğunu söyləyir. Amma ona inanmırlar ki, inanmırlar.

Bir neçə gün keçir, Məmmədiyə qayıtmır. Arvadı durub qapı-bacanı sökür, kəndirlə bağlayıb atır dalına. Düz şahın qapısına gəlir. Şah pəncərədən görür ki, budu bir arvad qapı-pəncərəni şələlənib gəlib. Adam göndərib soruşur ki, arvad nə istəyir? Arvad deyir:

– Məmmədiyə qapı-bacasını tapşırıb gedib. Neçə gündür muğayət oluram, bəsdi. Zəhmət çəksin gəlsin, qapı-bacasına yiyə dursun.

Şah görür ki, Məmmədiyə düz deyir, arvadı doğrudan da dəlidi. Əmr edir, Məmmədiyəni həbsdən açıb buraxırlar.

# RƏVAYƏTLƏR

## AXADUR

Axadur adlı pəhləvan cüssəli, aslan ürəkli bir igid vardı. Dünyada anasından başqa kimsəsi yoxdu. Ay keçir, il dolanır. Axadur anasının təkidi ilə qonşu kənddən bir qız ilə evlənir. Qız təmizkar, səliqəli və çox ağıllı olur. Əvvəl-əvvəl günləri çox xoş keçir. Amma gəlin qaynanasını istəmədiyini hamıdan gizləyir. Qaynanasından qurtulmaq üçün çox asan bir yol seçir. Hər gün Axaduru işə yola saldıqdan sonra qaynanasının əlinə bir çatı verib meşəyə odun gətirməyə göndərir. Meşədən yorğun gələn qaynana yemək istədikdə gəlin deyir:

– Təndir yansın, çörək yapaq, sonra yeyərsən.

Çörək bişir, qaynana çörək istəyir.

– Al, bir az da saqqız çeynə, çörək yemək yadından çıxar.

Bir xeyli saqqız çeynəyən qaynana görür ki, yox, lap acından ölür. Gəlinə yalvarıb deyir:

– A bala, acından ölürəm axı. Bir parca çörək versən qiyamət qopmaz ki?

Gəlin bu dəfə cızıq çəkib deyir:

– Bir az da burda oyna. Axşama nə qaldı ki? Axadur gələndə hamımız birlikdə yeyərik.

Odun gətirən, saqqız çeynəyən, cızıqda oynayan qaynana lap taqətdən düşür. Axşam Axadurun yanında bir tikə yeyər-yeməz yuxuya gedir.

Bu minvalla gəlin hər gün qaynananı yavaş-yavaş taqətdən salır. Anasının get-gedə zəiflədiyini görən Axadur anasından soruşur.

– Ay ana, sənin nəyin var? Gündən-günə zəifləyirsən?

Anası deyir:

– Bilmək istəyirsənsə bir gün işə getmə, evdə gizlən, səbəbini bilərsən.

Bunu eşidən Axadur səhər işə getmək adıyla evdən çıxır. Sonra xəlvətdən gəlib yükün dalında gizlənir. Ananın gündəlik işi başlanır. Ana gəlinindən səhər yeməyi istəyir, lakin gəlin çatı (kəndir) verib deyir:

– Yemək qaçmır ki? Get odun gətir, xəmir yoğurmuşam, çörək yapacam, sonra yeyərsən.

Ana dinməzcə çatını götürüb meşəyə yollanır. Bir vaxtdan sonra bir şələ odunla evə qayıdır. Yenə gəlindən yemək istəyir. Gəlin bir parça saqqız verib deyir:

– Çörək bişənə qədər çeynə, çörək bişəndə yeyərsən.

Ana saqqızı çeynəyir, çeynəyir, çeynəyir, çənəsi yorulur. Yenə gəlindən yemək istəyir. Gəlin bu dəfə yerdə cızıq çəkib deyir:

– Bir az da cızıqda oyna, Axadur işdən gələndə hamımız birlikdə yeyərik.

Ana cızıqda oynaya-oynaya oxumağa başlayır.

Axadur, yük dalından baxadur,
Gündə günüm belədir.
Şəftəlidən şələdir,
Saqqız verib çeynədir,
Cızıq çəkib oynadır.

Gəlin təəccüblənir və soruşur:

– Oxuduğun nədi elə?

Qaynana yenə cızıqda hoppandıqca deyir:

Axadur, yük dalından baxadur,
Gündə günüm belədir.
Şəftəlidən şələdir.
Saqqız verib çeynədir,
Cızıq çəkib oynadır.

Bütün bunları yük dalından görən Axadur ordan çıxır. Arvadını döyüb, söyüb evdən qovur. Ana-bala yenə də əvvəlki kimi mehriban yaşamağa başlayırlar.

## BƏXT APARIRAM

Kənddə iki qıza toy olur. Qızlar hərəsi başqa-başqa kəndlərə gəlin köçməli olurlar. Toyun səhəri qızların cehizlərini arabalara yükləyib yola salırlar. Qızlardan biri varlı ailənin qızı olur. Araba dolusu ipək yorğan-döşəklər, qu tükündən yastıqlar, gümüş bəzəkli sandıq, içi dolusu qızıl suyuna çəkilmiş gümüş qab-qacaqlar... Daha nələr, nələr... O biri qız isə kasıb ailənin qızı idi. Bir farmaşın içində bir dəst yataq, bir sandıq, içində də beş-altı mis qab-qacaq. Araba getdikcə boş sandığın içində danqıldayan qab-qacaqların səsini eşidən varlı qız kasıb qıza istehza ilə deyir:

– Cehizin elə budumu? Bax gör mən nələr aparıram.

Kasıb qız köksünü ötürərək deyir:

– Neynək, Sən qızıldan teşt apar, mən isə bəxt aparıram.

## TƏNBƏL QIZ

Çox gözəl, amma olduqca tənbəl bir qız vardı. Bu qız yetkinlik çağına çatmışdı. Gözəl idi, amma tənbəl olduğu üçün elçi gələn yox idi.

Bir gün təsadüfən Əli bu qızı görür və ona aşiq olur. Əli kəndin sevilən, seçilən, zəhmətkeş, ağıllı və yaraşıqlı oğlanlarından biri idi. Əlinin anasından başqa kimsəsi yox idi. Əli bir gün qəlbində gizlətdiyi sevgisini anasına açır. Zöhrəni ona elçiləməyi xahiş eliyir. Zöhrənin adını eşidən ana hirslənib özündən çıxır. Onun çox tənbəl olduğunu kənddə hamının bildiyini söyləyir:

– A bala, bu daşı ətəyindən tök. Ondan mənə gəlin, sənə arvad olmaz. Bu yaşlanmış vaxtımda mənə yazığın gəlsin. Mənim ona qulluq edəcək halım yoxdu!

Ana nə illah eliyir. Əli əl çəkmir ki, əl çəkmir:

– Ana, sən o qızı mənə al, gerisi ilə işin yoxdu, – deyir.

Əlacı kəsilən ana bir gün Zöhrəgilin qapısını döyür. Zöhrəni oğlu Əliyə elçiləyir. Zöhrənin ata-anası bilmirlər sevinsinlər, yoxsa kədərlənsinlər. Qızlarının çox tənbəl olduğunu, heç bir iş görmədiyini söyləyirlər. Əlinin anası bunları bildiklərini, buna baxmayaraq qızı istədiklərini söyləyir. Zöhrənin ata-anası məcbur olub qızlarını Əliyə nişanlayırlar. Toy tədarükü görülür. Əli sevdiyi qıza gözəl bir toy eləyir. Nəhayət, Zöhrə oğlan evinə gəlin köçür. Birinci gün Zöhrə atası evindəki vərdişinə əməl eləyir, yatağından qalxmır. Qaynanası səhər yeməyini onun yatağına gətirir. İki-üç gün belə davam edir. Təzə gəlindi, – deyib qaynana dözür. Dördüncü gün Əli anasına gəlinə yemək aparmamağı tapşırır. Gəlin ha gözləyir, ona yemək

gətirən olmur. Sabahı gün də ana-oğul oturub yeyirlər, gəlinə vermirlər. Əli işdən gələndə gəlin xəlvətcə anayla oğulun söhbətinə qulaq asır. Əli soruşur:

– Ana, bu gün nə iş gördünüz?

Anası cavab verir:

– Həyəti süpürdüm, evi yığışdırdım, yemək bişirdim, su gətirdim. Toplan da hürüb həyətə yad adam buraxmadı.

Əli süfrədən bir parça çörək götürüb anasına verir:

– Ana, bu çörəyi Toplana ver, gəl otur yeməyimizi yeyək.

Bu söhbəti eşidən gəlin başa düşür ki, iş görməsə ona yemək verməyəcəklər, acından öləcək. Səhər gəlin yerindən durur, həyəti süpürür. Evi səliqəyə salır. Səhəngi götürüb bulaqdan su gətirir. Qaynana isə qollarını çirmələyib dadlı yeməklər bişirir. Əli işdən gəlir. Süfrəni hazır görüb anasından soruşur:

– Bu gün nə iş gördünüz?

Anası deyir:

– Zöhrə həyəti süpürdü, evi təmizlədi, su gətirdi, süfrəni hazırladı. Mən yemək bişirdim. Toplan hürüb bostana girən quşları qovdu.

Əli bir parça çörək götürüb Toplana verir və Zöhrəni də süfrəyə çağırır. O gündən Zöhrə tənbəlliyin daşını atır. Qaynanasının qoçaq gəlini, ərinin isə çox sevdiyi xanımı olur.

Zöhrənin gəlin köçməsindən bir-iki ay keçir. Atasının, anasının gözü qapıda qalır. İndi qovarlar, bir azdan qovarlar, amma tənbəl qızları qayıtmır ki, qayıtmır. Anası bir az pay-püş hazırlayıb ərinin qoltuğuna verib deyir:

– A kişi, get gör bizim qızın başına nə gəldi? Nə yaxşı bir xəbər-ətər yoxdur?

Kişi ürəyində qızını danlaya-danlaya gəlib onlara çıxır.

– Görən, mənə nə deyəcəklər, – deyə, qorxa-qorxa qapını döyür.

Qapını Zöhrə açır. Atasıyla görüşür. Kişi görür ki, ev-eşik tərtəmizdir. Təndirdən də yemək qoxusu gəlir. Atasını oturdan Zöhrə tez qaçıb mətbəxdən bir-iki diş sarımsaq və sarımsaqdöyəni gətirir. Atasına verib deyir:

– Dədə, sən də bu sarımsaqları əz, yoxsa sənə yemək verməzlər. Təndirdə baş-ayaq var. İndi gələrlər, birlikldə yeyərik. Bunlarda iş görməyənə yemək vermirlər.

Ata barmağını dişləyib ürəyində kürəkəninə tənbəl qızını yola gətirdiyinə görə bərəkallah deyir.

## QADIN MƏKRİ

Bir-birini sevən, sayan ər-arvad vardı. Ər namaz-niyazlı və zəhmətkeş bir adam idi. Hər vaxt namazını qılar, işindən gücündən qalmazdı.

Arvadı isə evin işin-gücünü görər, vaxtında yeməyini bişirər, qalan vaxtlarında yun əyirib corab, köynək toxuyardı.

Bir gün kişi dəstəmaz alıb namaz qılmağa başladı. Arvadı əlində corab toxuya-toxuya ərinin dualarına qulaq asır. Görür ki, əri dualarında qadın məkrindən qorunmaq üçün dua etmədi. Ərinə dedi:

– A kişi, niyə demirsən Allahım, qadın hiyləsindən, şərindən bizi uzaq elə.

Əri deyir:

– Ay arvad, qadın nədi, onun məkri nə ola?

Arvadı ürəyində deyir:

– Yaxşı, sənə göstərərəm, qadın məkri nədir?

Bu söhbətdən bir müddət keçir. Əkin zamanı gəlib çatır. Bir dəfə arvad şum eliyən ərinə çörək aparanda bir neçə balıq alır. Ər kotan qoşub yer şumlayır. Arvad ərinin yanına çatana qədər balıqları arabir şumun arasına atır. Sonra süfrə sərib ərini yedirib-içirəndən sonra süfrəni yığışdırıb evə qayıdır. Kişi yeri şumladıqca balıqlara rast gəlir. Torbasına yığıb evə gətirir. Arvadına verib deyir:

– Şumların arasından balıq gətirmişəm, bişirərsən yeyərik.

Arvadı, – yaxşı, a kişi, – deyib balıqları götürür.

Sabah kişi işdən qayıdanda görür ki, arvad başqa şey bişirib. Dinmir, fikirləşir ki, yəqin sabah bişirər. Sabah evə gələndə görür ki, arvad balıqları yenə də bişirməyib. Soruşur:

– Arvad, balıqları nə yaxşı bişirmirsən?

Arvad təəccüblə soruşur:

– A kişi, nə balığı, hansı balığı?

Kişi deyir:

– Necə nə balığı? Şumdan gətirdiyim balıqları deyirəm da!

Arvad haray salıb qışqırır:

– Ay haray... Yetişin qonşular, ərim dəli olub.

Kişi arvadını sakitləşdirməyə çalışır:

– Ay arvad, niyə bağırırsan axı, şumdan gətirdiyim balıqları deyirəm! Əlimnən sənə verdim, axı!

Arvadın harayına qonşular tökülüb gəlir. Arvad əhvalatı qonşulara danışır. Qonşular da şumda balıq olmaz, – deyib kişinin dəli olmasına təəssüflənirlər. Kişi nə qədər

and-aman eləyir, heç kim ona inanmır. Qonşular arvadın xahişi ilə kişini dirəyə bağlayıb dağılışırlar.

Səhər arvad ərinin iplərini açıb yemək-çörək verib işə yola salır. Bir neçə gün belə keçir.

Bir gün kişi işdən gələndə arvad qarşılayıb süfrə ətrafında oturdur. Plov sinisini qabağına gətirir. Kişi dinməzcə qaşığı götürüb yeməyə başlayır. Bir qaşıq, iki qaşıq, üçüncü qaşıqda plovun altından balıq başı görünür. Kişi diksinib qaşığı ataraq dala çəkilir. Arvad bunu görüb soruşur:

– Nə oldu, a kişi?

Kişi qorxa-qorxa balığın başını göstərir. Arvad deyir:

– Qorxma, a kişi, sənin gətirdiyin balıqdır.

Kişi soruşur:

– Bəs deyirdiniz şumda balıq olmaz.

Arvad deyir:

– Bəli, olmaz. O balıqları şumun arasına mən atmışdım. Sənə qadın fitnəsinin nə olduğunu göstərmək istəmişdim. İndi gördünmü, qadın məkrindən Allaha sığınmaq lazımdır!

## ALTI DAŞ, ÜSTÜ AŞ

Ana öz oğlunu çox, lap çox sevirdi. Heç vaxt istəmirdi ki, oğlu bir şeyi özünə dərd eləsin. Evdə olanları heç vaxt oğluna xəbər vermir, qanıqaralıq yaratmırdı. Əvəzində isə gəlin qaynanasından qurtulmaq üçün onun yemək yediyi qabın içinə bir ləpik (daş) qoyur. Qaynana süfrədə qabına bir qaşıq, iki qaşıq aparır, üçüncüdə yemək qurtarırdı. Doyunca yemək yeyə bilməyən ana günü-gündən zəifləyir. Bir gün anasıgilə qonaq gələn qızı bunun səbəbini anasından soruşur. Ana daş əhvalatını qızına danışır. Qız qardaşına demək istədikdə ana qoymur. Oğlunun ailəsində narazılıq yaratmaq istəmir. Qız bu dəfə anasını öz evinə aparır. Bir müddət qızıgildə qalan ana kürəkəninin etinasızlığına, kobudluğuna hər dəfə bəhanə axtarıb qanqaralıq yaratmasına dözə bilmir. Qızına deyir:

– A bala, apar məni öz evimə. Altı daş, üstü aş, yenə oğul yaxşıdı.

## QARĞA

Baba nəvəsini çox, lap çox sevirdi. Hara getsə əlindən tutub aparır, nə istəsə alır, hər kəlməsinə min dəfə can deyirdi.

Baba bir dəfə bostan əkirdi. Həmişəki kimi nəvəsi də yanında idi. Nəvə gördü ki, ağacın budağına bir quş qondu. Babasına göstərib soruşur:

– Baba, o nədi?

Babası cavab verir:

– Qarğadı, baba qurban.

Bir az keçir, nəvə bir də soruşur:

– Baba, o nədi?

– Baba sənə qurban, qarğadı.

Bir az keçir, nəvə yenə soruşur.

– Baba, o nədi?

– Balacan, qarğadı.

Bu minvalla nəvə bəlkə də yüz dəfə soruşur. Baba isə hər dəfə onu əzizləyərək cavab verir:

Aradan illər keçir. Nəvə böyüyüb pəhləvan cüssəli bir kişi olur. Baba isə əli çəlikli, taqətsiz bir qoca. Bir gün nəvə həyətdə yer belləməklə məşğul olur. Baba isə bir tərəfdə oturub ona tamaşa eliyir. Bu vaxt bir qarğa hasarın başına qonur. Baba keçmiş günləri xatırlayaraq nəvəsindən soruşur:

– A bala, hasarın başındakı nədi elə?

Nəvə işindən ayrılmadan – qarğadı, – deyir.

Bir az keçir, baba yenə soruşur:

– A bala, gözüm seçib eləmir, o nədi elə?

Nəvə bu dəfə səsini qaldıraraq deyir:

– Qarğadı da!

Bir az keçir, baba bir də soruşur:
– Hasarın başındakı nədi, a bala?
Nəvə hirslənərək deyir:
– Dedim ki, qarğadı da, a kişi!
Baba köksünü ötürərək deyir:
– Bilirəm qarğadı, a bala. Sənin uşaqlığını yadıma saldım. Sən də uşaq olanda bu sualı mənə bəlkə də yüz dəfə vermişdin. Amma mən sənə hirslənməmişdim. Hər dəfə can, qurban olumla cavab vermişdim.

## DAŞDƏMİR

Nənənin Daşdəmir adında bir nəvəsi olur. Daşdəmir çox qoçaq və zəhmətkeş oğlan olur. Bir gecə Daşdəmirgildə hamı yatır. Nənəni isə yuxu aparmır. Bir də görür ki, iki nəfər xəlvətcə evlərinə girdi. Oğruları görən nənə özünü yuxuda sayıqlayan kimi göstərir. Oğrular arvadı kiritmək üçün qaranlıqda tapdıqları qaysıdan birini onun ağzına qoyurlar. Nənə qaysını çeynəyə-çeynəyə deyir:
– Ağzım dada gəldi, ağzın dada gəlsin.
Bu dəfə oğrular nənənin çənəsindən tutub qorxutmaq istəyirlər ki, kirisin. Nənə deyir:
– Vay çənəm, vay çənəm...
Oğrular deyir:
– Ay arvad, biz ki səni vurmadıq.
Nənə cavabında uzada-uzada deyir:
– Bəlkə vureydin, bəlkə vureydin.
Axırda oğrular nənədən əl çəkib əllərinə gələni yığmağa başlayırlar. Nənə isə yatağında öz-özünə söylənir:

Vay baldırım, vay baldırım,
Baldırıma tuman aldırım.
İçində bir oğlum olsun,
Adını qoyum Daşdəmir.
Çıxım yüksək təpə başına
Bağırım:
– Ay Daşdəmir, ay Daşdəmir...

Daşdəmir yuxudan dik atılıb soruşur:

– Nədi, ay ana, noldu?

Oğrular Daşdəmirin oyandığını görüb qorxularından yığdıqlarını da qoyub qaçırlar.

## XAŞIL ƏHVALATI

Həmid beş bacının bir qardaşı idi. Qırx qurbanla tapıldığı üçün ərköyün böyüdülmüşdü. Əkin-biçin işlərini atası tək görərdi. Həmid isə hər gün tay-tuşları ilə gündüzünü gecə eliyərdi. Bir gecə atası onu qabağına qoyub xeyli danladı. Bir işin qulpundan yapışmağının vaxtı çatdığını söylədi. Belə danlağa öyrənməyən Həmid çox pərt oldu. Səhər dədəsi çölə əkinə getdi. Həmid yenə də kefi istəyəndə yuxudan durdu. Anası xaşıl bişirmişdi. Həmid bəlkə kömək eləyər: – deyə, anası atasına xaşılı onunla göndərdi. Atasının danlağı Həmidə xoş gəlməmişdi. Odur ki, əkinə çatan kimi atasını çağırdı:

– Dədə, xaşıl soyudu, gəl ye.

Atası işini buraxıb yemək üçün gəldi. Bağdaş qurub əyləşdi. Qaşığı götürüb xaşıldan bir qaşıq ağzına qoydu.

Udqundu, gözündən yaş axmağa başladı. Xaşıl boğazını yandırmışdı. Həmid soruşdu:

– Dədə, niyə ağlıyırsan?

– Həmid adlı oğlum ölüb, onunçün ağlıyıram, – dedi atası.

## EŞŞƏK ƏHVALATI

İki elti olur. Bunlar bir-biri ilə çox mehriban dolanırlar. Evin bütün işlərini həvəslə görür, boş vaxtlarında şirin-şirin söhbət eləyirdilər. Bir gün fikirləşirlər ki, qaynanaya ehtiyacları yoxdur. Ondan qurtulmaq lazımdı. Arvadın əlini-ayağını bağlayıb təndirə salırlar. Sacı da təndirin ağzına qoyurlar. Qaynana nə qədər yalvarır, onu təndirdən çıxartmırlar. Gəlinlərin başı söhbətə qarışır. Bir də baxırlar ki, axşam olub. Tez çöl işlərini görməyə başlayırlar. Qaynana təndirdə oturub qulaq asır. Toyuq-cücə səsi gəlir. Arvad fikirləşir ki, aha, toyu-cücəni içəri saldılar. Bir azdan qoyun-quzu səsi gəlir. Sevinir ki, qoyun-quzunu da tövləyə saldılar. Sonra inək-dana səsi gəlir. Arvad onun da yerbəyer olduğunu bilir. Ha gözləyir eşşəyin səsi gəlmir. Bağırır:

– A bala, eşşək meşədə qaldı. Canavar yeyəcək.

Nə qədər bağırır, hay verən olmur. Eşşəyin də səsi gəlmir. Gəlinlər də fikirləşir ki, arvad təndirdən çıxmaq üçün bağırır. Əlacı kəsilən qaynana eşşək kimi anqırmağa başlayır. Bunu eşidən gəlinlər:

– Vay, eşşək meşədə qaldı, – deyib, çölə qaçırlar.

Eşşəyi gətirəndən sonra arvadı təndirdən çıxarıb üst-başının külünü çırpıb təmizləyirlər. Əl-ayağının ipini açırlar:

– Sən elə burdaca otur. İşlərimizə nəzarət eləməyin bəsdi. Sən eşşəyi yadımıza salmasaydın, qurd yeyəcəkdi, onda vay bizim halımıza, – deyirlər.

## DÜNYA QARIŞIR

Ər-arvad çox çətin dolanırdılar. İl quraqlıq keçdiyinə görə qıtlıq düşmüşdü. Ərzaq çətin tapılırdı. Arvad qonşudan gələndə ərinə dedi:

– Gülbahar xaşıl bişirir.

Ər tez arvadına dedi:

– Gəl belə eləyək. Sən təngənəfəs özünü onların evinə sal, mən də dalınca. Guya sən qaçırsan, mən də səni qovuram.

Yemək vaxtı arvad özünü təngənəfəs Gülbahargilə salır, əri də dalınca.

Sinidə xaşıl çəkmişdilər. Ortasını çuxur eliyib yağ, qıraqlarına isə qurut tökmüşdülər. Onları da xaşıl yeməyə oturtdular. Taxta qaşıqlarla yeməyə başladılar. Ev yiyəsi soruşdu:

– Ay qonşu, nə məsələdi, niyə dalaşırsınız?

Kişi dedi:

– Mən deyirəm, gəl belə eləyək, bu yolnan gedək, – deyərək xaşılı qaşıqlayıb yağı öz tərəfinə axıdır.

Qonşu görür ki, belə getsə yarma xaşılını yağsız yeyəsi olacaq, yağlı yerini qonşu yeyəcək. Odur ki deyir:

– Eh, ay qonşu, fikir eləmə, bu dünyanın işləri elə qarışıqdı, – deyib, xaşılın hamısını yağla qarışdırır.

# MƏN GƏLİN İDİM, DİLLƏNMƏZ İDİM

Çox gözəl, yaraşıqlı bir qız vardı. Qonşu kənddən elçi düşüb, toy eliyib aparırlar. Oğlan evində gərdək asıb qızı dalında oturdurlar. Oğlan toyu başlanır. Gərdəyin dalından tamaşa eliyən qız görür ki, təndirdə biş-düş eliyib məclisə daşıyırlar. Zurnanın, nağaranın səsi kəndi başına götürüb. Toyun sonu çatır. Nağara çalan nağaranı təndir damında qoyub məclis olan yerə yeməyə gedir. Gəlin görür ki, it gəldi, nağaranın dərisini cırıb yedi və getdi. Səsini çıxarmır. Bir azdan nağara çalan nağaranın dalınca gəlir. Nağaranı cırılmış görüb hirslənir. Bunu kimin elədiyini gəlindən soruşur. Gəlin deyir:

– Mən gəlin idim, dillənməz idim. Ham-hamı gəldi, dım-dımı cırdı.

Hirslənmiş nağaraçı cırılmış nağaraya bir təpik vurub gedir. Gəlin görür ki, bir azdan bir kişi gəldi. Kişi görür ki, təndir köz salıb qızarıb, yanında da yuyulmuş qarın-qarta var. Qarın-qartanı şişə taxıb salır təndirin içinə. Bişirib dartışdıraraq yeməyə başlayır. Gəlin bəyin gəlib çıxmadığını görüb, başını gərdəkdən çıxaraq kişidən soruşur:

– Qarın-qarta dartan baba, sən də bu evdənsənmi?

Kişi deyir:

– Qarın-qarta dartan baba sənin gülün, sən də onun bülbülün.

Gəlin barmağını dişləyir. Bilir ki, onu bu kişiyə gətiriblər. Yavaşca yerdəki sənəyi götürüb döşəkçənin üstünə qoyur. Dingəsini çıxarıb səhəngin başına taxır. Gülbəngisiynən də səhəngi bükür. Gizlincə çıxıb gedir.

## FIRIM TUTUB

Çox zəhmətkeş, çalışqan bir kişi olur. Arvadı isə onun tərsi, tənbəlin biri olur. Kənddə bütün kişilər arvadlarının toxuduğu naxışlı corab geyərdilər. Bu kişi də bir gün arvadına deyir:

– Mənə bir cüt corab toxusan dünya dağılmaz ki?

Arvadı deyir:

– Niyə hirslənirsən, a kişi? Baş üstə, toxuyaram, niyə toxumuram ki?

Arvad başlayır yun yumağa. Kişi görür ki, arvadı bir cüt corabın yununu bir aya yuyub, qurudub, diddi. Sonra daraq qoyub bir aya da daradı. Cəhrə gətirib əyirməyə başladı. Beləcə qış gəlib keçdi, yaz gəldi. Arvad yumaqları xəlbirin içində yükün üstünə qoydu.

– Toxuyaram, qaçacaq deyil ki, – dedi.

Yaz keçdi, payız gəldi. Yağışlar başladı. Kənd əhli ermənilərin bir-bir kəndlərə hücum elədiyini eşidib köçüb-qaçmaq məcburiyyətində qaldılar. Bu kişi də əlinə keçəndən arabaya yükləyib köçə qoşuldu. Araba daşa-daşa azan çayın ortasına çatanda arvad qışqırdı:

– A kişi, düş, arabanı saxla, sənə corab toxuyacam.

Kişi dedi:

– Arvad, dəli olubsan, nədi? Bu qaçaqaçda corabın hayıdı?

Arvad dedi:

– A kişi, fırım tutub, indi toxuyacam, sonra məndən corab-zad istəmə ha...

## BİRCƏ SƏNİ DƏ MİNEYDİM....

Qaçaqaç vaxtı kənddə hər kəs əlinə keçəni atın, eşşəyin belinə yükləyib yağı əlindən qaçmağa, canını qurtarmağa çalışırdı. Nəvə yaşı yüzü keçmiş nənəsini eşşəyin belinə bağladığı səbətin içində oturdur. Eşşəyin xotuğu da anasının yanınca gedirmiş. Nəvənin bütün fikri qaçaqaçda, yağıdan qurtarmaq hayında olur. Qabaqdakı dağın arxasına keçəndən sonra rahatlayan nəvənin yadına nənəsi düşür. Bir də görür ki, səbətin içində oturan nənə yırğalandıqca anasının yanınca yortan xotuğun başını tumarlayaraq deyir:

– Bircə səni də mineydim,

Bircə səni də mineydim...

Düşmən xofundan qurtaran nəvə nənəsinin bu sözlərinə ürəkdən qəhqəhə çəkib gülür.

O vaxtdan babaların, nənələrin dilində “bircə səni də mineydim” sözləri nəvələri əzizləmək üçün bir oxşamaya, nazlamaya çevrilib.

## MƏNİMKİ DAĞA, DAŞA, SƏNİNKİ GƏLSİN BAŞA

Oğlu şəhərə iş dalınca gedən ana evdə qərar tuta bilmirdi. Gah içəri girir, gah bayıra çıxır, gözü yollarda qalırdı. Ürəyindən qara qanlar axırdı.

– Görəsən, balam necə oldu? İtə-qurda rast gəlməz, inşallah. Qaranlığa qalmadan gəlib çıxar yəqin ki?

Gəlin isə öz kefində idi. Dodaqaltı oxuya-oxuya ərinin sevdiyi yeməyi bişirirdi. Sevinirdi, əri söz verdiyi hədiyyəni bu dəfə mütləq alacaqdı.

Qaynana gəlinin kefinin kök olduğunu görüb soruşur:

– A bala, bu uşaq harada qaldı?

Gəlin deyir:

– Narahat olma, indi gələr. Mənim hədiyyəmi almaq üçün gecikir.

Qaynana deyir:

– Ay gəlin, mənim ürəyimdəki dağa-daşa, sənin dediklərin gəlsin başa!

## AĞZIM DADA GƏLDİ

Allahqulugilin qonşuluğunda iki qardaş yaşayırdı. Onlar analarını çox sevirdilər. Allahqulu tez-tez qardaşlara gəlib-gedər, hal-əhval tutardı. Bir müddət sonra qardaşlar görürlər ki, anaları hər şeydən narazılıq edir. Qardaşlar, gəlinlər nə illah eliyirlər analarını razı sala bilmirlər. Axırda analarının dərdini soruşurlar. Məlum olur ki, anaları Allahquluya vurulub. Deyirlər:

– Ay ana, o, sənin oğlun yerindədi. Aləm bizə nə deyər? Bizi rüsvay eləmə.

Arvad əl çəkmir ki, əl çəkmir. Məni Allahquluya ərə verməlisiniz, vəssəlam!

Əlacı kəsilən qardaşlar bir gecə analarını götürüb bir mağaraya qoyurlar.

– Ana, səni Allahquluya veririk. İndi oğlan adamları gəlib səni götürəcəklər.

Qardaşlar gizlənib gözləyirlər. Fikirləşirlər ki, yuvasına qayıdan canavar arvadı boğar. Onlar da arvadı aparарlar evlərinə. – Anamız öldü, – deyib basdırarlar.

Bir az keçir canavar mağaraya girir. Arvad canavarın gözlərinin parıldadığını görüb elə bilir ki, oğlan evi lopalarla onu aparmağa gəlib. Deyir:

– Gəldilər, ay gəldilər. Gəlini köçürməyə gəldilər.

Canavar arvadı iyləyir. Arvad elə bilir ki, Allahquludu, gülüb deyir:

– Anarı yeri, mənim qıdıqlanmaqdan xoşum gəlmir.

Bir az keçir, canavar dişləyir. Arvad deyir:

– Anarı yeri, öpməyin yox, qucaqlamağın yox, acı-acı dişləməyin var.

Qardaşlar dözə bilmirlər. Canavarı qovub analarını evə gətirirlər. Gecə hamı yatır, Allahqulunun məhəbbəti arvadı yatmağa qoymur. Bir də görür ki, evə oğrular girdi. Arvad başlayır yalandan zarımağa:

– Ay Allahqulu, ay Allahqulu, hoy...

Oğrular arvadı susdurmaq üçün tapdıqları ərikdən birini onun ağzına qoyurlar. Arvad deyir:

– Ağzın dada gəlsin, ay Allahqulu, ağzım dada gəldi. Ağzım ilan quyruğu dadırdı.

Arvadın kirimədiyini görən oğrular onun ağzından əriyi çıxardılar ki, arvad bəlkə kiriyə. Arvad deyir:

– Ağzın zəhər dadsın, ağzım təzə dada gəlmişdi.

Yenə sayıqlayır:

– Ay Allahqulu, Ay Allahqulu, hoy...

O biri otaqda yatanlar səsə hay verdiyinə görə oğrular qaçmalı olurlar. Arvad dallarınca deyir:

Apardınız ha, boğazınızda qalar.

Hirslənən oğrulardan biri geri dönüb deyir:

– Ay yazıq, nəyin vardı ki, nə aparaq!

## SAMAN ƏHVALATI

Bir ili quraqlıq olduğu üçün Güllübulağın camaatı lazım olduğu qədər ot-alaf tədarükü görə bilməmişdi. Qış uzanır, yaz gəlmək bilmirdi. Gah hava düzəlir, gah alaçalpoy qar yağır, bəzi evlərdə ot, saman tükənirdi. Həmişə olduğu kimi, Məşədi Mirzənin mərəyindən saman qurtarmırdı.

Qonşu Məşədi Həşimin tayasından saman lap azalmasına baxmayaraq qurtarmırdı. Əslində, Məşədi Həşim tayadakı samanı heç işlətmir, qohum-qonşunun gözündən pərdə asmaq üçün saxlamışdı. Hər gecə saman səbətini götürüb qonşusu Məşədi Mirzənin mərəyinə gələr və deyərmiş:

– Əssalaməleykum, ey Məşədi Mirzə, sizdən iki səbət saman borc aparmağa gəlmişəm.

Sonra da özü-özünə cavab verərmiş:

– Buyur, ay Məşədi Həşim, o nə sözdü, nə qədər istəyirsən apar.

Beləcə, bir müddət Məşədi Mirzənin mərəyindən saman aparır.

Bir gün Məşədi Mirzə hiss eləyir ki, mərəkdəki saman xeyli azalıb. Qonşu Məşədi Həşimin tayasındakı saman isə necə var, eləcə durur. Şübhələnir. Gecənin birində mərəkdə gizlənir. Gecənin bir vaxtı bir də görür ki, qonşusu Məşədi Həşim çiynində boş saman səbəti ilə mərəyə girdi. Öz-özünə danışmağa başaldı:

– Əssalaməleykum, ey Məşədi Mirzə, sizdən iki səbət saman borc aparmağa gəlmişəm. İnşallah, ölmədən borcunu qaytarmaq nəsib olar.

Sonra öz-özünə cavab verir:

– Buyur, ay Məşədi Həşim, o nə sözdü? Nə qədər istəyirsən apar.

Səbəti doldurub kürəyinə qaldırmaq istəyəndə Məşədi Mirzə gizləndiyi qaranlıqdan çıxıb səbəti Məşədi Həşimin kürəyinə qaldırıb yola salır.

## DEDİM, DEMƏMİŞ OLUM

Çox yaxın iki rəfiqə olur. Biri səliqəli, biş-düşlü, ailəcanlı, evinə, ailəsinə sədaqətli və əxlaqı təmiz olur. Digər rəfiqə isə bunun tamam tərsi olur. Di gəl ki, düzgün olanın əri adam çərlədən, hər şeyə bəhanə tapıb danışan, arvadının canını boğazına yığan olur. O biri rəfiqənin əri isə arvadını çox sevən, başına dolanan, arvadı nə istəsə onu eləyən olur.

Bir gün bu rəfiqələr dərdləşəndə əxlaqı və xasiyyəti gözəl olan əyri təbiətli olan rəfiqəsinə deyir:

– Daha mən də sənin kimi əyri olacam, bəlkə ərim qiymətimi bilə.

Rəfiqəsi gülüb deyir:

– Heç zəhmət çəkmə, sən bacarmazsan.

– Niyə? Səndən çirkinəm, nə təhər olur, sən kefin istədiyini eliyirsən. Üstəlik ərin də başına dolanır. Mənimki isə canımı boğazıma yığır. Yox, daha mən də sənin kimi olacam.

O birisi deyir:

– Zəhmət çəkmə, bacarmazsan.

O deyir:

– Yox, bacaracam.

Belə olanda, əyrilik eliyən rəfiqəsinə məsləhət verir:

– Gəl sınayaq. Bu gün bir şey bişir özün ye, hər şeyi yığışdır, ərin gələndə qaş-qabağını tök. Yemək istəsə, heç nə bişirməmişəm de. Sonrasına baxarıq.

Beləcə şərtləşib ayrılırlar.

Gəlin gəlir evinə. Qış olduğu üçün qəşəng bir xaşıl bişirir. Yağla, qurutla yeyir. Qab-qacağı yuyur. Hər şeyi yığışdırıb oturur cəhrənin başında. Başlayır yun əyirməyə. Bir az keçir, əri gəlir. Arvadını qaş-qabaqlı görüb hirsli-hirsli yemək istəyir. Arvadı halını pozmadan heç nə bişirmədiyini söyləyir. Əri qışqırıb deyir:

– Bişirməmisən? Bəs o xaşıllı qaşıq nədi qoymusan cəhrənin yanına?

Gəlin görür ki, xaşılı qarışdırdığı qaşıq yadından çıxıb cəhrənin yanında qalıb. Bir söz demədən tez yerindən durur. Ərinə əppəkaşı bişirib onu rahatlayandan sonra qaçır qonşuya. Rəfiqəsinə deyir:

– Yox, bacı. Mən bir xaşılı gizli yeyə bilmədim. Məndən elə şeylər çıxmaz. Sən deyəndi, doğrudan, mən bacara bilmərəm. Dedim, deməmiş olum!

## QAPI AÇANIM DOĞULUB

Bir-birini çox sevən iki gənc evlənir. Ata-analarının onlar üçün yaratdığı hər cür şəraitdə rahat yaşamağa başlayırlar. Gənc ailə olduqları üçün hər ikisinin ata-anaları onları bir ehtiyacları varmı deyə tez-tez ziyarət edirlər. Yalnız qalıb rahat olmaq istəyən gənc evlilər belə bir qərara gəlirlər.

– Bu gün hansımızın ata-anası gəlirsə gəlsin, qapını açmayaq. Elə bilsinlər evdə yoxuq. Qapını döyüb-döyüb qayıdarlar.

Onların qərarlarından bir neçə saat keçir, oğlanın ata-anası gəlir. Qapını döyürlər. İçəridəkilər baxıb görürlər ki, gələnlər oğlanın ata-anasıdır. Gedib sakitcə divanda otururlar. Bayırdakılar qapını döyür, döyür, evdə kimsənin olmadığını düşünüb qayıdırlar. Bir neçə saatdan sonra qapı yenə döyülür. Bu dəfə baxırlar ki, gələn qızın ata-anasıdır. Yenə gedib divanda otururlar. Qapı təkidlə döyülür. Dözə bilməyən qız başlayır ərinə yalvarmağa.

Əri: – olmaz, – deyib durur. Bu dəfə qız başlayır ağlamağa. Qızın ağlamağına dözməyən oğlan gedib qapını açır. Özlərini yuxulu göstərirlər, guya eşitməyiblər.

Aradan bir vaxt keçir. Gəlin hamilə olur, vaxt-vədə çatır. Gözəl, göyçək bir qızları olur. Oğlan olmasını arzulayan ata-analar görürlər ki, qız olduğu üçün gənc ata çox sevinir. Soruşurlar:

– Biz oğlan arzulayırdıq. Sən nə yaxşı qıza bu qədər sevinirsən?

– Niyə sevinməyim? Quş olub uçmaq istəyirəm. Axı, qapıaçanım doğulub.

## QIŞ ƏHVALATI

*Bu əhvalatı mənə nənəm söyləyib*

O vaxtlar hələ kənddə elektrik yox idi. Evlərdə çıraq yandırırdılar. Qışın uzun gecələrində məhəllə adamları bir evə yığışardılar. Nağıl deyər, söhbət eliyər, beləcə uzun qış gecələrini başa vurardılar. Kənddə evlər bir az yerdən qazılmış, bir-birinə bitişik olardı. Təndir qalayıb çörək yapanda təndirin külünü evin damına tökər, bərk-bərk tapdalayardılar ki, yağış yağanda dammasın. Bir məhəllədən digərinə keçmək üçün bəzən evlərin üstü ilə gedər, bilməzdilər ki, ayağının altındakı dam kimin evinin damıdır. Bir gün belə qış gecələrinin birində damların üstü ilə o biri məhəlləyə getmək istəyirdim ki, birdən ayağımın altındakı mərtək qopdu və mən guppultu ilə içəri düşdüm. Hər tərəf qaranlıq idi. Gözümü qaranlığa alışdıraraq qapını tapıb çıxmaq istədim. Bir də gördüm ki, əlində çıraq bir qadın qapını açıb içəri girdi. Mən tez yanımdakı ot səbətini qaldırıb altında gizləndim. Məqsədim qadın gedəndən sonra dalınca çıxıb getmək idi. Demə, düşdüyüm yer Milazgilin aşxanası imiş. Arvad əlindəki çırağı bir taxtın üstünə qoydu. Qoltuğundakı xonçanı da onun yanına. Taxtın qabağına da gətirib bir stol qoydu, çıxıb getdi. Səbətin arasından maraqla baxırdım. Bir də gördüm ki, həmin arvad bəzəkli-düzəkli bir qızı gətirib taxtda oturtdu və çıxıb getdi. Bir az keçmiş yaraşıqlı, belində xəncəri, ayağında xrom çəkmələri olan bir oğ-

lan da gəlib qızın qarşısında oturdu. Başa düşdüm ki, bunlar nişanlıdır. Biz azdan qız naz ilə oğlandan soruşdu:

– Məni harda bəyəndin?

Oğlan həvəslə cavab verdi:

– Məhərrəmin toyunda ceyran kimi süzəndə bəyəndim. Bir qalx oyna, bir də baxım.

Oğlan çırtıq çalıb zümzümə etməyə başladı. Qız həvəslə qalxıb süzərək bir dairə vurub əyləşdi. Bu dəfə oğlan qızdan soruşdu:

– Bə sən məni harda bəyəndin?

Qız dedi:

– Elə Məhərrəmin toyunda at çapıb, qılınc oynadanda bəyəndim. Bir qalx, xəncərini oynat, bir də baxım.

Oğlan yerindən durdu. Xəncərini çəkib bir o yana, bir bu yana yüyürdü. Gizləndiyim səbətin üstünə cumanda elə bildim ki, səbəti doğrayacaq, vay mənim halıma. Bunu fikirləşməyimlə səbəti oğlanın üstünə tullamağım bir oldu.

– Vay, burda cin var, – deyib, – çığırışaraq qapıdan çıxdılar.

Eləmədim tənbəllik, xonçanı qoltuğuma vurub mən də bunların dalınca qaçdım. Beləcə eşik qapını taparaq ordan qaçdım. Evə gəldim. Xonçanı açdıq. İçində nələr yoxdu? Püsküllü şirniyyatlar, çərəzlər. Bax, o sinini – tərəkdəkini deyirəm. Görürsən ha, həmin xonçanın sinisidi. İndiyənə kimi qalır.

Səhər kəndə xəbər yayıldı ki, Milazgilin aşxanasında cin var. O olar, bu olar, heç kəs qorxudan o aşxanaya tək getməzdi. Mən də xonçanı gətirdiyim üçün bu məsələnin üstünü vurmazdım. Hə, nə isə, bu da qış gecələrindəki əhvalatlardan biri idi.

## HEÇ DƏ AĞLAMAYIN!

Güllübulaqlı Axund İsmayıl Şamda ali dini təhsil görmüş, “Quran”ı və İslam dinini mükəmməl bilən yüksək təhsilli və dünyagörmüş bir şəxsiyyət imiş.

Kənddə məhərrəmlik ayında imamların taziyəsi zamanı avazı gözəl olan, lakin dini və elmi təhsili olmayan Mahmud kişi mərsiyə dedikdə hamı ağlayar, heç kim göz yaşını saxlaya bilməzdi.

Belə taziyə günlərinin birində Axund İsmayıl da mərsiyə demək məcburiyyətində qalır. Nə qədər oxuyursa heç kəsin gözündən bir gilə yaş çıxmır. Hirslənən axund deyir:

– Heç də ağlamayın! Elə bil imamlar mənim əmim oğludu!

## ELƏ YAXŞI AXSAYIRDIM Kİ...

Güllübulaqdakı rus-tatar məktəbində müəllim işləyən İsa Məşədi Namaz oğlu məktəb tətilində istirahət etmək istəyirdi. Lakin məhsul yığımı olduğu üçün qardaşları onun da çölə işləməyə gəlməsini istəyirdilər. O, işləməyin dərdindən ayağını sarıyıb ufuldayır, beləliklə, elə bilirdi çölə kərəntiyə getməkdən canını qurtarıb. Gecə yatanda bacısı Sara İsanın ayağındakı sarığı açıb o biri ayağına bağlayır. Səhər yuxudan duran İsa indi də digər ayağı tərəfə axsamağa başlayır. Bunu görənlər qəhqəhə çəkib gülürlər. Ayağındakı sarığın dəyişdiyini başa düşən İsa deyir:

– Bıy sizi qırılasınız. Elə yaxşı axsayırdım ki, canımı işdən qurtarmışdı.

## VƏSFİ-HALLAR

Dərdlərə daldım ancaq,
Başımda yaşıl sancaq[1].
Nə qız oldum, nə gəlin,
Dərdlərə yandım ancaq.

Bulağın başı mənəm,
Dibinin daşı mənəm.
Yar üçün ağlayanın
Gözünün yaşı mənəm.

Aşıq saz dilləndirir[2],
Məclisi güllləndirir.
Əmim oğlu yamandı,
Dilsizi dilləndirir.

Ocaq qala alışsın[3],
Oğlan qıza qarışsın.
Yarı yardan eliyən,
Xınan külə qarışsın.

Ələk ələk asdılar[4],
Qazıya pul basdılar.
Mənim də nikahımı
Zorla xana kəsdilər.

Qızıl üzük qınnanmaz,
Bu qədər yar sınanmaz.
Əhdimə vəfadaram,
Xoyrat ona inanmaz.

Öysüzün* öyü gəlir,
Məktəb böyüyü gəlir.
Oxuyub elm alıbdır,
Anamın göyü* gəlir.

Hər yerin şoranı var,
Hər əvin yorğanı var.
Gedəndə də bəyən get,
Desinlər oğlanı var.

Bu yollar cada yollar,
Sirr verməz yada yollar.
Qurban ollam yarıma,
Yetirsə, dada yollar.

Obada, eldə çoban,
Tütəyi dildə çoban.
Qar yağıb dizə çıxıb,
Qal bizim eldə, çoban.

Əzizim, qarımasın[5],
Al geysin, yarımasın.
Məndən qeyri yar sevsə,
Murazı yarımasın.

* Öysüz – kənd adı
* Göy – kürəkən

Arxalığın qədək, yar,
Geymə, gələr gödək, yar.
Get atını mahmızla,
Gəl bərabər gedək, yar.

Ay bacadan, bacadan,
İşıq düşər bacadan.
İnsafa gəl bir dəfə,
Şirin söz de ucadan.

Güllərə bax, güllərə,
Güllər qonub kollara.
Bir cüt bazbənd olaydım,
Yarımdakı qollara.

Gedirəm yol uzunu,
Xançalım qol uzunu.
Necəsən bir ah çəkəm,
Yanasan il uzunu.

Bənövşənin bəndi yar,
İlqar verdi döndü yar.
Mən can üstə olanda,
Görəsən nə ündü, yar.

Şirincə yasdığım yar,
Bağrıma basdığım yar.
Dağlarca güvəndiyim,
Bə hanı dostluğun, yar.

Sandıq üstə sandığım,
Sandığa sığındığım.
Hayıf cavan ömrümə,
Yar deyib inandığım.

Əlində nal oynadır,
Cibində pul oynadır.
Kül başına, ay cavan,
Qız qoyub, dul oynadır.

Payız yazdan yaxşıdı,
Ördək qazdan yaxşıdı.
Toyda bir gəlin gördüm,
Vallah, qızdan yaxşıdı.

Qar yağır kəpək kimi,
İşıldar ipək kimi.
Arxamca nə baxırsan
Qudurmuş köpək kimi.

O taydan top atdılar,
Obanı oyatdılar.
Dedilər yarın gəlir,
Ürəymi oynatdılar.

Çıxdım divar üstünə,
Durmamışdım qəsdinə.
Yar da qızıl almanı,
Vurdu sinəm üstünə.

İnciyəm, xırdalama,
Kösövəm, qurdalama.
Geri dur, odum yandırar,
Sən məndə qurd* arama.

Boyu boy yaraşığı,
Qolu toy yaraşığı.
Anamın bir göyüsən*,
A soylar* yaraşığı.

Qayalar dirəm, dirəm,
Boyunu hardan görəm.
Quşlar da dil bilmir ki,
Sənə namə göndərəm.

Adın Hasandı, yarım,
Sevmək asandı, yarım?
Əlin heç işə yatmır,
Hansı zamandı, yarım?

Eləmi dövlətliyə,
Daş yağsın Dövlətliyə*.
Yarım çox dövlətlidi,
Dəyişməm dövlətliyə.

* qurd – kin, küdurət
* göy – kürəkən
* soy – nəsil, kök
* Dövlətli – kənd adı

Eləmi üzəngidə,
Süvari üzəngidə.
Gəl bir də halallaşaq,
Əl əldən üzən gündə.

Qapısı şorğan oğlan,
Qaşları urğan oğlan.
Sevdin, ala bilmədin,
Qəmənnən* doğran, oğlan.

Qardaşım birdi mənim,
Gözümə nurdu mənim.
İsmarladım*, gəlmədi,
Yığvalım* kürdü* mənim.

Eləmi burda deyil,
Axtarma, orda deyil.
Canım necə can versin?
Sevdiyim burda deyil.

Mənəm dağın lalası,
Sənə fəda olası.
Boyuna qurban kəsim,
Qaynanamın balası.

---

* qəmə – bıçaq
* ismarlamaq – xəbər göndərmək
* kür – pis mənasında
* yığval – bəxt, tale

Bu gələn arabadı,
Dörd təkər arabadı.
Üç gündür yar gedəli,
Evimiz xarabadı.

Yarım yaraşıq sözüm,
Allah, mənə bir dözüm.
Yolda yoldaşı qurban,
Evə gələndə özüm.

Yolu yol elədi qız,
Yola gül ələdi qız.
Açdı sinə bəndini,
Yara əl elədi qız.

Bağa gəl, bostana gəl,
Gülünü dəstələ, gəl.
Yar, yadıma düşübsən,
Yolunu dəstələ gəl.

Ələyəz ələmlidi,
Dörd yanı qələmlidi.
Ələyəzdən qız alanın
Ürəyi vərəmlidi.

Yarı yola salmışam,
Qayğısına qalmışam.
Mən yarımın iyini
Bacısından almışam.

Aşiq, ay ağa məni,
Dindir, ay ağa, məni.
Mən gözəllər başıydım,
Saldın ayağa məni.

Ağrı dağı ikidi,
Dağların ən dikidi.
Eldə bir yar sevmişəm,
Pəhləvanın təkidi.

Ahu dağda dolaşır,
Gəzir, dağda dolaşır.
Soyxa qalmış bilərzik,
Yar telinə dolaşır.

Kəklik ötər qayada,
Hədəf olar sayada.
İgid ona demişəm,
Öpə, yarın oyada.

Dağlar başında əlik,
Qızlar yığar əvəlik.
Biz elə bir millətik,
Ölənə tək sevərik.

Çoban, itin qudursun,
Arxacında su dursun.
Özünə qarğamıram,
Bacının dili dursun.

Çiyin-çiyinə durduğum,
Çiyninə çuxa saldığım.
Ayağın altı göy çəmən,
Boyuna qurban olduğum.

Mixək əkdim dəs ilə,
Yar sevdim həvəs ilə.
Yarı mənnən eliyən,
Günün keçsin yas ilə.

Ay doğub ayan-ayan,
Ağ teştdə paltar yuyan.
Məhlənizə qoymurdun,
Qoynuna girdim, oyan.

Araz, Araz, xan Araz,
Bingöldən qalxan Araz.
Deyirlər yarım gəlir,
Bir yana çalxan, Araz.

Ölürəm, üstümə gəl,
Yanıram, tüstümə gəl.
Sağlığımda gəlmədim,
Məzarım üstünə gəl.

Qoyun bərədən gəldi,
Quzu dərədən gəldi.
Nə yağar var, nə əsər,
Tufan haradan gəldi?!

Dam üstə uzanıbsan,
Bayramdı, bəzənibsən?
Bayramın qara gəlsin,
Sən kimə güvənibsən.

Əlindəki nardımı?
Cibin ağzı dardımı?
Mən burda can verirəm,
Qulaqların kardımı?

Ay qu məni, qu məni[6],
Nə çağırır bu məni?
Yaylığın kəfən elə,
Göz yaşınla yu məni.

Ağbabadı yolun, yar,
Yasdığındı qolum, yar.
Necə mənsiz yatırsan?
Daş ürəkli, zalım yar.

Ağbaba yolu fərman,
Torpağı cana dərman.
Yardan bir namə aldım,
Yarı dərd, yarı dərman.

Damda dirək olarmı?
Şana kürək olarmı?
Mən didərgin düşmüşəm,
Məndə ürək olarmı?

Orda bir binə saldım[7],
Qapısını günə saldım.
Külüng vurdum, bel qırdım,
Bilmədim kimə saldım.

Təndirim həb-həb oldu,
Ürəyim kabab oldu.
Mən vətəndən gəlməzdim,
Qarabağ səbəb oldu.

Eləmi kətan sarı,
Geyməyə kətan sarı.
Çıxaydım dağ döşünə,
Baxaydım vətən sarı.

Eləmi ay incələr,
Ay doğar, ay incələr.
Vətəndən ayrı düşən
Nə durar, nə dincələr.

Hamasa ağ olaydı,
Dörd yanı bağ olaydı.
Məni sevən oğlanın
Atası sağ olaydı.

Təndir mənim, bad mənim,
Sınıq könül şad mənim.
Elə ona yanıram,
Yar özgənin, ad mənim.

Əlində ələmi var,
Qarğıdan qələmi var.
Özü gələ bilmirsə,
Gələnnən salamı var.

Corabın ağına bax,
Dəstələ, bağına bax.
El yadına düşəndə,
Ağbaba dağına bax.

Bu qala nə qaladı?
Torpağı Kərbəladı.
Ölüm Allah işidi,
Ayrılıq nə bəladı?

Püşülər, ay püşülər,
Əl dəyməmiş xışılar.
Beş ildi yar sevmişəm,
Təzə duyub qonşular.

Ələyəzin ətəyi,
Doludu bal pətəyi.
Əlimi çəngəl edim,
Çəkim yarın ətəyin.

Hamasa ələmlidi,
Dörd yanı qələmlidi.
Vətən qoyub gələnin
Ürəyi vərəmlidi.

Gəl gedək baş bulağa,
Suyu sərxoş bulağa.
Birin sən de, birin mən,
Tökək qan-yaş bulağa.

Arazdan axmağın var,
Gümüşdən çaxmağın var.
İstər öldür, istər qoy,
Bir yara baxmağın var.

Dağların başı mənəm,
Dibinin daşı mənəm.
Gündüz gəzən sonanın
Gecə yoldaşı mənəm.

Arazın qırağıynan,
Gül biçdim orağıynan.
İtirmişəm vətəni,
Gəzirəm sorağıynan.

Damdıranı alaydım,
Çəmənlikdə çalaydım.
O qədər ölməyəydim,
Sevdiyimi alaydım.

Bir gül əkdim, gördülər,
Göyərməmiş dərdilər.
Bəxtəvər qız başına,
Sevdiyinə verdilər.

Səni sevdim qaşınnan,
Qorxuram qardaşınnan.
Səni bir gün görməsəm,
Ağlım gedər başımnan.

Qapıları qalındı,
O qız mənim yarımdı.
Qızın könlü məndədi,
Qardaşları zalımdı.

Yaylıq tikdim, gəl apar,
İtirmə, düşmən tapar.
Məndən gözəl yar sevsən,
Gəl məni nökər apar.

Təndirim yana-yana,
Od saldım qana, qana.
Əzəldən bəyənmirdin,
İndi qal yana-yana.

Kəklik daşda durubdu,
Qələm qaşda durubdu.
Yarı çirkin olanın
Fələk başa vurubdu.

Ay doğub bəs deyilmi?
Qaleyli tas deyilmi?
Qızın ala gözləri
Oğlana bəs deyilmi?

Getmişdim Ördəhliyə*,
Tər tökdüm köynəkliyə.
Kasıbdı, kamallıdı,
Vermərəm dövlətliyə.

Kərəntinin pasına,
Qurban olum səsinə.
Məhəmməd evdə yoxdu,
Hamza bəy arxasına.

Oğlan, adın Ənnağı,
Kəkilin bostan tağı.
Necəsən gözdən salam,
Olasan çarıq bağı.

Oğlan, adın Yaqubdu,
Gün dağlarda doğubdu.
Verdiyin qızıl üzük,
Barmağımı boğubdu.

Oğlan, adın Bəysəfa,
Ağzın gül, qoynun səfa.
Sevdiyini almasan,
Bivəfasan, bivəfa.

Oğlan, adın Məhəmməd,
Ağzın gül, qoynun cənnət.
Sevdiyini almadın,
Müxənnətsən, müxənnət.

---

* Ördəkli – kənd adı

Oğlan, adın Hacıdı,
Boyun gül ağacıdı.
Əyil, üzündən öpüm,
Şəkər səndən acıdı.

Oğlan, adın Aslandı,
Gün dağlarda yasdandı.
Verdiyin qızıl üzük,
Barmağımda pasdandı.

Lənkə tumanım, lənkə,
Yeridim silkə, silkə.
Yarı məndən eliyən
Doğransın tikə-tikə.

Ağ donu əsdir, yeri,
Qıypaça kəsdir, yeri.
Yar yanından keçəndə,
Yenə o dəstir yeri.

Ağ donun ağlı qalsın,
Buxçada bağlı qalsın.
Yarı yardan eliyən,
Ciyərin dağlı qalsın.

Ağ donu ağartmışam,
Belini daraltmışam.
Özüm çirkin deyiləm,
Yüzünü saraltmışam.

Mintənəm xara dəydi,
Qolum divara dəydi.
Dilim, ağzım qurusun,
Nə dedim yara dəydi.

Yarımı yarımasın,
Al geysin, qarımasın.
Söz ki verdi, almadı,
Heç kəsnən yarımasın.

Çəkməni çəkdir, oğlan,
Boyun göyçəkdir, oğlan.
Sən gəzdiyin Hamasa,
Çəmən çiçəkdir, oğlan.

Bir ay doğdu dənizdən,
Saraldım dərdinizdən.
Gündə bir xəbər gəlir,
Verana məhlənizdən.

Qara toyuq hindədi,
Yumurtası pindədi.
Qızların gül yaylığı
Yarının cibindədi.

Arxalıq aldırsana,
Yaxalıq saldırsana.
Məni sənə vermirlər,
Bir cadı yazdırsana.

Başında heyratı var,
Heyratının qatı var.
Mən sənə gəlməz idim,
Məndə mərd qeyratı var.

Ağbaba gözəl yerdi,
Yar gəlib gəzən yerdi.
Əlini ver əlimə,
Əl əldən üzən yerdi.

Daşkörpünün daşdarı,
Gül açdı xaşxaşdarı.
Məni yardan edənin,
Qırılsın qardaşları.

Arpa gölü sonalı,
Əli əlvan xınalı.
Bir elə yar sevmişəm,
Qabağı zər xanalı.

Corabın ağına bax,
Dəstələ bağına bax.
Vətən yadına düşəndə
Təpəkənd dağına bax.

Ağbaba yolu çalı,
At oynar, tökər nalı.
Siz olasız o Allah,
Göndərin gəlsin yarı.

Mən öldüm ağlamaqdan,
Bağa su bağlamaqdan.
Bağda xəzəl qalmadı,
Yarama bağlamaqdan.

Yatıram yanım yanır,
Dururam canım yanır.
Qəfil didərgin düşdüm,
Dərddən hər yanım yanır.

Buxarı qurum oldu,
Yandıqca qurum oldu.
Vətəndən ayrı düşdüm,
Mənə lap zülüm oldu.

Arxalığın oyallar,
Belə gəlmə duyallar.
Yar, səni öldürərlər,
Məni mağmın qoyallar.

Əlində var qavlama,
Ala gözlüm, ağlama.
Mən buralı deyiləm,
Mənə meyl bağlama.

Atım daydı, dağ aşmaz,
Çulu bozdu, yaraşmaz.
Yar dağda, mən aranda,
Bizə sevgi yaraşmaz.

Ay qız, adın Qızyetər,
Baban şamama əkər.
Səni mənə versələr,
Ollam babana nökər.

Dam üstə qara toyuq,
Yannarı oyuq-oyuq.
Hamının yarı gəldi,
Gəlmədi qanı soyuq.

Əmim oğlu elinə,
Şal yaraşır belinə.
Əmisi qızı qurban
Qələm tutan əlinə.

Əmim oğlu, el oğlu,
Evinə dolsun oğru.
Sən ki məni almadın,
Qoy aparsın el oğlu.

Əmim qızı, el qızı,
Evinə dolsun quzu.
Sən ki mənə gəlmədin,
Qoy gətirim el qızı.

Gedirsən məni də apar,
Qarğaram, boran qopar.
Qiyamət qopan günü,
Sevən sevəni tapar.

Damdam üstə darvaza,
Bəylər durub namaza.
Mən səni gizli sevdim,
Nə tez saldın avaza.

Qapımızdan çay axır,
Yönü qibləyə baxır.
Azacıq durub baxsan,
Yengəm başıma qaxır.

Qızıl üzük, dal barmaq,
Sinəmə keçdi qarmaq.
Ellər şirin yuxuda,
Bizə qaldı yalvarmaq.

Arxalığın şaldı, yar,
Dərdin məni aldı, yar.
İkimizin sirr sözü,
Sən gələnə qaldı, yar.

Ay çil-çilə qardaş[8],
Atın qamçıla, qardaş.
Əylən bir söz söyləyim,
Könlün açıla, qardaş.

Qardaş, qardaş, can qardaş,
Xəncərin gümüş, qardaş.
Saçım üzəngin olsun,
Gəl qapımda düş, qardaş.

Qalanın bürcü mənəm,
Dilbilməz gürcü mənəm.
Məni ver sevdiyimə,
Mən sizdən incimərəm.

Get bazara əncir al,
Saatına zəncir al.
Uzaq yoldan gəlibsən,
Gir qoynuma, dincin al.

Barmağım beşdi mənim,
Yaşım on beşdi mənim.
Cəfa çəkdim, yar sevdim,
Əməyim heşdi mənim.

Yapıncın qıyqacına,
Şahı düzüm ucuna.
Məni sənə verməzlər,
Salma bəylik gücünə.

Arxalığın çil-çili,
Öpüm ağzın içini.
Gedibdi, gələcəkdi,
Məhlənin göyərçini.

Oğlan, adındı Qasım,
Quran gətir, əl basım.
Aynan orucun tutum,
İldə qurbanın kəsim.

Getdikcə yol yoncadı,
Baxdıqca bel incədi.
Qərarımız o qərar,
Şərtimiz ölüncədi.

İrəvan daşdı gərək,
Yar qələm qaşdı gərək.
Neynirəm qoca yarı,
Yar on beş yaşdı gərək.

Ay qız, adın Səlbidi,
Tumanın gülbəngidi.
Açarın qızıl açar,
Sandığın firəngidi.

Ay qız, adın Gülüsüm,
Bağınızdan gül üzüm.
Gəl alım xan qardaşa,
Alnına qızıl düzüm.

“Şal”ım qana boyandı,
Ucu yerə dayandı.
Mənim ahu-zarımdan
Göydə mələk oyandı.

Gəl, məni fağır ağla,
Fağır qoy, fağır ağla.
Tayım-tuşum yanında
Adımı çağır, ağla.

Gəzərəm oğrun-oğrun,
Mələrəm yorğun-yorğun.
Ürəyimə dərd salıb,
Çəkərəm oğrun-oğrun.

Gedirdim qırağınnan,
Gül biçdim orağınnan.
İnnən belə gəzərəm,
Adınnan, sorağınnan.

Ay, sənə daldalanım,
Gün, sənə daldalanım.
Özün getdin, qurtardın,
Mən kimə daldalanım?

Eləmi günə düşdüm,
Kölgədən günə düşdüm.
Düşmənin gözü aydın,
Dediyi günə düşdüm.

Damdan dama gəzərlər,
Damda qurud əzərlər.
Bəxtəvər qız başına,
Gəlin kimi bəzərlər.

Evləri, eşikləri,
Xırdadır beşikləri.
Çıxaram yar görünməz,
Yıxaram eşikləri.

Çaxmağı çaxan ölsün,
Qıyqacı baxan ölsün.
Mən səni çox sevirəm,
Sənə kəc baxan ölsün.

Çaxmağı çaxdın, neynim,
Qıyqacı baxdın, neynim?
Uydun elin sözünə,
Evimi yıxdın, neynim?

Çaxmaq üstə qovam mən,
Ölməmişəm, sağam mən.
Yarıma xəbər verin,
Dərdindən naçağam* mən.

Su sənəyi deyiləm,
Su görəndə əyiləm.
Get, özünə yar tapnan,
Mən sən diyən deyiləm.

Qayadan atdım qarı,
Xonçaya düzdüm narı.
Küsdürdüm yola saldım,
Bənövşə bığlı yarı.

Liliparlı bulaqlar,
Üstü qarlı bulaqlar.
Yarım səndən su içib,
Etibarlı bulaqlar.

---

* naçağ – xəstə

Qaranquşam, qalxaram,
Qanadımı çalxaram.
Desələr yarın gəlir,
Ölü olsam, qalxaram.

Qaranquşum, qalx indi,
Qanadını çalx indi.
Mən sevdim, sən apardın,
Nə dedi bəs xalq indi?

Dəyirman üç dolanır,
Suyu sərxoş dolanır.
Görən buna nə olub,
Yolları boş dolanır.

Qızıl üzüyün yanı,
Durmur barmağımın qanı.
Dünən görünən oğlan
Görünmür bu gün, hanı?

Qızıl üzük qınnanmaz,
Bu qədər yar sınanmaz.
O qədər and içirəm,
El oğludu, inanmaz.

Qızıl üzük firuzə,
Gedin deyin xoruza.
Bannamasın bu gecə,
Yarım qonaqdı bizə.

Qızıl üzük dar-darı,
Yeri qoşun sərdarı.
Evimizə gəlmirsən,
Qonşumuza gəl barı.

Qızıl iynənin sapı,
Sizin yol, bizim qapı.
Yarı yardan eliyən,
Diləsin qapı-qapı.

Arxalığın iki qat,
Birni saxla, birni sat.
Malna kı qıymırsan,
Canın çıxsın yalqız yat.

Arxalığın çitdən, yar[9],
Ötür məni itdən, yar.
Axşam oldu, gün batdı,
İndi gələr cütdən yar.

Ağbaba qaralıbdı,
Üstünü tor alıbdı.
Qorxma, ay ürkək gözəl,
Vədələr daralıbdı.

Ağbaba çiçəkləndi,
Dörd yanı ləçəkləndi.
Oğlan toyu çalındı,
Köçməyin gerçəkləndi.

Çobanam qoynunuza,
Babalım boynunuza.
Ya məni evləndirin,
Ya alın qoynunuza.

Ağ çuxa armaxları,
Çiynində qarmaxları.
Çala bilmir kamanı,
Qırılıb barmaxları.

Ağ çuxan ağlı qala,
Boğçada bağlı qala.
Sən ki məni almadın,
Ciyərin dağlı qala.

Boz atım boza-boza,
Çiynində yaşıl qoza.
Asta yeri, çər dəymiş,
Yarı batırdın toza.

Boz atım, kəhər atım,
Yüklərəm səhər atım.
Qurbanam kəhər, sana,
Xan qardaş amanatım.

Qardaş, atın nalıyam,
Üstü ipək xalıyam.
Qardaş, mənə can demə,
Mən özgələr malıyam.

Qardaşdar, ay qardaşdar,
Yağış yağar, qar başdar.
Cənazəm nisgil gedər,
Yapışmasa qardaşdar.

Qardaşdar qardaşıyam,
Qanlı gözlər yaşıyam.
Kimin qardaşı yoxsa,
Mən onun qardaşıyam.

Təndirə yapdım lavaş,
Oğlan, gəl yavaş-yavaş.
Şahdan əmr gəlibdi,
Oğlan qıza qarabaş.

Təndirə aş qoymuşam,
Üstə lavaş qoymuşam.
Gündüz gəlmə, gecə gəl,
Yanımı boş qoymuşam.

Mərcimək gilə-gilə,
Doldurram silə-silə.
Sən qapıdan keçəndə,
Çıxaram gülə-gülə.

Mən bir uca qamışam,
Qapınızda durmuşam.
İstər al, istər alma,
Alnına yazılmışam.

Səhəng sussuz olarmı?
Dibi qumsuz olarmı?
Gedin deyin Hitlerə,
Gəlin yarsız olarmı?

Damdan baca dəlindi,
Tamam da qız, gəlindi.
Sizə Allah veribdi,
Mənə Allah kərimdi.

İynədənlik miliyəm,
Xas parçalar gülüyəm.
Siz Allah, qarğamayın,
Çoxdandı sevgiliyəm.

Yeri, hilalım, yeri,
Saçı zülalım, yeri.
Qarğayım ərin ölsün,
Səni dul alım, yeri.

Kiməm mən...
Loğmanam, həkiməm mən.
El köçdü, qaçqın oldum,
Kim bilir ki, kiməm mən.

Gəlin, gəlin, ay gəlin,
Qaşlarındı yay, gəlin.
Oxun atıb qorxutma,
İstəmərəm pay, gəlin.

Qardaş, qardaş, ay qardaş,
Qaşın ucu yay, qardaş.
Yad qızı yaman olur,
Umma məndən pay, qardaş.

Yad qızı bizi yad eylər,
Əlimizdən dad eylər.
Dünyanı daşısaq da,
Yenə də fəryad eylər.

Səni sevirəm deyər,
Qazandığını yeyər.
İş müşkülə düşəndə,
Başını yerə əyər.

Gəlin, gəlin, ay gəlin,
Bitsin felin, ay gəlin.
Dünya malından ötrü,
Acı dilin, ay gəlin.

Canım, gözüm, ay gəlin,
Bitdi sözüm, ay gəlin.
Oğlumu sənə verdim,
Çətin dözüm, ay gəlin.

Oğlum üçün dözürəm,
Hər felini çözürəm.
Aranızda qaldım, bax,
Qəm gölündə üzürəm.

Nanay nanayın bəndi,
Nanay bürüdü kəndi.
Pul verib satın allam,
Yarım oturan kəndi.

Stol üstə nağara,
Saçım gəlmir darağa.
Yar, məni qonaq elə,
Bir stəkan arağa.

Oğlan, adın Katibdi,
Gün dağlarda batıbdı.
Verdiyin qızıl üzük,
Ürəyimə yatıbdı.

Qala qalaya baxır,
Qaladan sular axır.
Sən yadıma düşəndə
Gözümdən qanlar axır.

## KƏKLİKLƏ BAĞLI BAYATILAR

Qadan canıma, a kəklik,
Dur gəl yanıma, a kəklik.
Xınalı barmaqların
Batır qanıma, a kəklik.

Kəkliyin səkər gedər,
Tükünü tökər gedər.
İki könül bir olsa,
Yolları sökər, gedər.

Kəklik gördüm, boz, ala,
Qaşdar qara, göz ala.
İgid ona demişəm,
Sevdiyini tez ala.

Kəklik daşda nə gəzir?
Qələm qaşda nə gəzir?
Yarı gözəl olanın
Ağlı başda nə gəzir?

## NANAYLAR

### BƏNDƏ GƏL, AY OĞLAN...

Bəndə gəl, ay oğlan, bəndə gəl[1],
Mən suya endim, sən də gəl.

Ay doğub halay döyül,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Gümüşdü, qalay döyül.
Mən suya endim, sən də gəl.
Qınamayın, ay ellər,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Ayrılıq qolay döyül,
Mən suya endim, sən də gəl.

Mən bir uca qamışam,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Qapınızda durmuşam,
Mən suya endim, sən də gəl.
İstər al, istər alma,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Alnına yazılmışam.
Mən suya endim, sən də gəl.

Bənövşəyəm, tütərəm,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Kol dibində bitərəm.
Mən suya endim, sən də gəl.
Hamının yarı gəlsə,
Bəndə gəl, ay oğlan, bəndə gəl.
Mən boynumu bükərəm.
Mən suya endim, sən də gəl.

## NARGİLƏ, NARGİLƏ, NARGİLƏ YAR

Qapı qapıya baxar,
Nargilə, nargilə, nargilə yar,
Qapıda sular axar.
Gözdərəm yar gələ, yar gələ yar.
Azacıq durub baxsan,
Nargilə, nargilə, nargilə yar,
Yengəm başıma qaxar.
Gözdərəm yar gələ, yar gələ yar.

Yar deyilsən yalansan,
Nargilə, nargilə, nargilə yar,
Canım oda salansan.
Gözdərəm yar gələ, yar gələ, yar.
Neynirəm dünya malın,
Nargilə, nargilə, nargilə yar,
Bir başıma dolansan.
Gözdərəm yar gələ, yar gələ yar.

Qayadan atdım qarı,
Nargilə, nargilə, nargilə yar.
Xonçaya düzdüm narı.
Gözdərəm yar gələ, yar gələ yar.
Küsdürdüm yola saldım,
Nargilə, nargilə, nargilə yar,
Bənövşə bığlı yarı.
Gözdərəm yar gələ, yar gələ, yar.

## VALAM YANA, VALAM YANA, YANA

Qapımızda cüt qalax,
Valam yana, valam yana, yana,
Telli qızı biz alax.
Yandı bağrım, döndü qana, qana.
Anasından almışıq,
Valam yana, valam yana, yana,
Atasına yalvaraq.
Yandı bağrım, döndü qana, qana.

Arxalıq aldırsana,
Valam yana, valam yana, yana,
Yaxalıq saldırsana.
Yandı bağrım, döndü qana, qana.
Məni sənə vermirlər,
Valam yana, valam yana, yana,
Bir cadı yazdırsana,
Yandı bağrım, döndü qana, qana.

Mərcimək gilə-gilə,
Valam yana, valam yana, yana.
Doldurram silə-silə.
Yandı bağrım, döndü qana, qana.
Sən qapıdan keçəndə
Valam yana, valam yana, yana.
Çıxaram gülə-gülə.
Yandı bağrım, döndü qana, qana.

## OY AMAN, OY AMAN, OY AMANDI[2]

Mən gedirəm ağlama,
Oy aman, oy aman, oy amandı.
Ürəyimi dağlama.
Yar yardan ayrılmaq nə yamandı,
Gedib yenə gələrəm.
Oy aman, oy aman, oy amandı.
Özgəyə bel bağlama,
Yar yardan ayrılmaq nə yamandı.

Qızıl üzüyün yanı,
Oy aman, oy aman, oy amandı.
Durmur barmağının qanı.
Yar yardan ayrılmaq nə yamandı,
Dünən görünən oğlan,
Oy aman, oy aman, oy amandı,
Görünmür bu gün hanı?
Yar yardan ayrılmaq nə yamandı.

Arxalığın şaldı yar,
Oy aman, oy aman, oy amandı,
Dərdin məni aldı yar.
Yar yardan ayrılmaq nə yamandı.
İkimizin sirr-sözü
Oy aman, oy aman, oy amandı,
Sən gələnə qaldı, yar.
Yar yardan ayrılmaq nə yamandı.

## SARIMA QURBAN, SARIMA QURBAN

Gedirsən əylənirsən,
Sarıma qurban, sarıma qurban.
Qeyri-dil öyrənirsən.
Sarı köynəkli yarıma qurban.
Dilindən bir kağız ver,
Sarıma qurban, sarıma qurban.
Deyirlər evlənirsən.
Sarı köynəkli yarıma qurban.

Damdan dama gəzərlər,
Sarıma qurban, sarıma qurban.
Damda qurut əzərlər.
Sarı köynəkli yarıma qurban.
Bəxtəvər qız başına,
Sarıma qurban, sarıma qurban.
Gəlin kimi bəzərlər.
Sarı köynəkli yarıma qurban.

Bir gül əkdim gördülər,
Sarıma qurban, sarıma qurban.
Göyərməmiş dərdilər.
Sarıköynəkli yarıma qurban.
Bəxtəvər qız başına,
Sarıma qurban, sarıma qurban,
Sevdiyinə verdilər.
Sarıköynəkli yarıma qurban.

## ŞIX-ŞIX BİLƏRZİK QOLUMA-QOLUMA[3]

Kəklik gördüm boz, ala,
Şıx-şıx bilərzik qoluma, qoluma,
Qaşdar qara, göz ala.
Sallanıb hamam yoluna, yoluna.
İgid ona demişəm,
Şıx-şıx bilərzik qoluma, qoluma,
Sevdiyini tez ala.
Sallanıb hamam yoluna, yoluna.

Kəkliyim səkər, gedər,
Şıx-şıx bilərzik qoluma, qoluma.
Tükünü tökər, gedər.
Sallanıb hamam yoluna, yoluna.
İki könül bir olsa,
Şıx-şıx bilərzik qoluma, qoluma,
Dağ-daşı sökər, gedər.
Sallanıb hamam yoluna, yoluna.

Kəklik daşda nə gəzər,
Şıx-şıx bilərzik qoluma, qoluma,
Qələm qaşda nə gəzər?
Sallanıb hamam yoluna, yoluna.
Yarı gözəl olanın,
Şıx-şıx bilərzik qoluma, qoluma,
Ağlı başda nə gəzər?
Sallanıb hamam yoluna, yoluna.

## ALMA SƏNƏ, HEYVA SƏNƏ, NAR MƏNƏ

Ağbaba yolu çalı,
Alma sənə, heyva sənə, nar mənə.
At oynar, tökər nalı.
Qəlyanı doldur bacadan ver mənə.
Siz olasız o Allah,
Alma sənə, heyva sənə, nar mənə,
Göndərin gəlsin yarı.
Qəlyanı doldur bacadan ver mənə.

Ağbaba qaralıbdı,
Alma sənə, heyva sənə, nar mənə,
Üstünü tor alıbdı.
Qəlyanı doldur bacadan ver mənə.
Qorxma, ürəksiz gözəl,
Alma sənə, heyva sənə, nar mənə,
Vədələr daralıbdı.
Qəlyanı doldur bacadan ver mənə.

Ağbaba çiçəkləndi,
Alma sənə, heyva sənə, nar mənə.
Dörd yanı ləçəkləndi.
Qəlyanı doldur bacadan ver mənə.
Oğlan toyu çalındı,
Alma sənə, heyva sənə, nar mənə.
Köçməyin gerçəkləndi.
Qəlyanı doldur bacadan ver mənə.

## AY SARI KÖYNƏK, SARI SALDATLARI

Qaranquşam, qalxaram,
Ay sarı köynək, sarı saldatları.
Qanadımı çalxaram.
Vaenkom qoymur gələ saldatları.
Desələr yarın gəlir,
Ay sarı köynək, sarı saldatları.
Ölü olsam qalxaram,
Vaenkom qoymur gələ saldatları.

Ay qız,adın Zərqələm,
Ay sarı köynək, sarı saldatları.
Hitler qoymur mən gələm.
Vaenkom qoymur gələ saldatları.
Qarğayın, Hitler ölsün,
Ay sarı köynək, sarı saldatları,
Bəlkə mən də tez gələm.
Vaenkom qoymur gələ saldatları.

Səhəng sussuz olarmı?
Ay sarı köynək, sarı saldatları.
Dibi qumsuz olarmı?
Vaenkom qoymur gələ saldatları.
Gedin deyin Hitlerə,
Ay sarı köynək, sarı saldatları.
Gəlin yarsız olarmı?
Vaenkom qoymur gələ saldatları.

## YANDIRIN QIZLAR, SINDIRIN BUDAQLARINDAN...

Qızıl üzüyün yanı,
Yandırın qızlar, sındırın budaqlarından.
Durmur barmağımın qanı.
Mən durum öpüm yar, sənin dodaqlarından.
Dünən görünən oğlan,
Yandırın qızlar, sındırın budaqlarından.
Görünmür bu gün, hanı?
Mən durum öpüm yar, sənin dodaqlarından.

Qızıl üzük qınnanmaz,
Yandırın qızlar, sındırın budaqlarından.
Bu qədər yar sınanmaz.
Mən durum öpüm yar, sənin dodaqlarından.
O qədər and içirəm,
Yandırın qızlar, sındırın budaqlarından.
Yad oğludu, inanmaz.
Mən durum öpüm yar, sənin dodaqlarından.

Qızıl iynənin sapı,
Yandırın qızlar, sındırın budaqlarından.
Sizin yol, bizim qapı.
Mən durum öpüm yar, sənin dodaqlarından.
Yarı yardan eliyən,
Yandırın qızlar, sındırın budaqlarından.
Dilənsin qapı-qapı.
Mən durum öpüm yar, sənin dodaqlarından.

## LALAM SƏNİ, LALAM SƏNİ, SƏNİ

Arxalığın dardarı,
Lalam səni, lalam səni, səni.
Gəl qoşunun sərdarı.
Anam qoymur alam səni, səni.
Evimizə gəlmirsən,
Lalam səni, lalam səni, səni.
Qonşumuza gəl barı.
Anam qoymur alam səni, səni.

Arxalığın qədəh yar,
Lalam səni, lalam səni, səni.
Geymə, gələr gödək, yar.
Anam qoymur alam səni, səni.
Get atını mahmızla,
Lalam səni, lalam səni, səni.
Gəl barabar gedək, ayr,
Anam qoymur alam səni, səni.

Arxalığın iki qat,
Lalam səni, lalam səni, səni.
Birni saxla, birini sat.
Anam qoymur alam səni, səni.
O ki malına qıymırsan,
Lalam səni, lalam səni, səni.
Canın çıxsın yalqız yat.
Anam qoymur alam səni, səni.

## ŞAFTALI DİLİM, DİLİM, DİLİM, DİLİM...

Şaftalıyam, kalam mən,
Şaftalı dilim, dilim, dilim, dilim.
Dilim yoxdu, lalam mən.
Gəl otur mənim gülüm, mənim gülüm.
Qürbət eldə qız sevdim,
Şaftalı dilim, dilim, dilim, dilim.
Pulum yoxdu, alam mən.
Gəl otur mənim gülüm, mənim gülüm.

Şaftalılar dəyəndə,
Şaftalı dilim, dilim, dilim, dilim.
Meynələr baş əyəndə.
Gəl otur mənim gülüm, mənim gülüm.
Səni gəlin köçürrəm,
Şaftalı dilim, dilim, dilim, dilim.
Toy libasın geyəndə.
Gəl otur mənim gülüm, mənim gülüm.

Şaftalı çiçəkləndi,
Şaftalı dilim, dilim, dilim, dilim.
Dörd yanı ləçəkləndi.
Gəl otur mənim gülüm, mənim gülüm.
Qız, gözün aydın olsun,
Şaftalı dilim, dilim, dilim, dilim.
Toyunuz gerçəkləndi.
Gəl otur mənim gülüm, mənim gülüm.

## NANAY, NANAY, NANAY, NANAY...

Qızıl üzük firuzə,
Nanay, nanay, nanay, nanay.
Gedin deyin xoruza.
Gözəl oğlan, xəzəl oğlan.
Banlamasın bu gecə,
Nanay, nanay, nanay, nanay.
Yarım qonaqdı bizə.
Gözəl oğlan, xəzəl oğlan.

Qızıl üzük, dal barmaq,
Nanay, nanay, nanay, nanay.
Sinəmə keçdi qarmaq.
Gözəl oğlan, xəzəl oğlan.
Ellər şirin yuxuda,
Nanay, nanay, nanay, nanay.
Bizə qaldı yalvarmaq.
Gözəl oğlan, xəzəl oğlan.

Qızıl üzüyün yanı,
Nanay, nanay, nanay, nanay.
Durmur barmağımın qanı.
Gözəl oğlan, xəzəl oğlan.
Dünən görünən oğlan,
Nanay, nanay, nanay, nanay.
Görünmür bu gün, hanı?
Gözəl oğlan, xəzəl oğlan.

## ƏLİYAR, ƏLİYAR, ƏLİYAR, ƏLİYAR

Sandıq üstə səməni,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Gül bürüdü çəməni.
Qolları düyməli yar, Əliyar, Əliyar.
Mən səni çox sevmişəm,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Elçi göndər, al məni.
Qolları düyməli yar, Əliyar, Əliyar.

Sandıq üstə gəzərəm,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Sandığa gül bəzərəm.
Qolları düyməli yar, Əliyar, Əliyar.
Ağır elin qızıyam,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Qürbət eldə gəzərəm.
Qolları düyməli yar, Əliyar, Əliyar.

Sandıq üstə sandığım,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Sandığa dayandığım.
Qolları düyməli yar, Əliyar, Əliyar.
Hayıf mənim ömrümə,
Əliyar, Əliyar, Əliyar, Əliyar.
Yad oğluna yandığım.
Qolları düyməli yar, Əliyar, Əliyar.

## AY SARI SEYRANI YAR, AY SARI SEYRANI YAR

Bu gün ayın üçüdü,
Ay sarı seyranı yar, ay sarı seyranı yar.
Girmə bostan içidi.
Maralı ceyranı yar, maralı ceyranı yar.
Dodaqların bal, şəkər,
Ay sarı seyranı yar, ay sarı seyranı yar.
Dilin badam içidi.
Maralı ceyranı yar, maralı ceyranı yar.

Yar deyilsən, yalansan,
Ay sarı seyranı yar, ay sarı seyranı yar.
Canım oda salansan.
Maralı ceyranı yar, maralı ceyranı yar.
Neynirəm dünya malın,
Ay sarı seyranı yar, ay sarı seyranı yar.
Bir başıma dolansan.
Maralı ceyranı yar, maralı ceyranı yar.

Çəkməni çəkdir, oğlan,
Ay sarı seyranı yar, ay sarı seyranı yar.
Boyun göyçəkdir, oğlan.
Maralı ceyranı yar, maralı ceyranı yar.
Sən gəzdiyin Hamasa,
Ay sarı seyranı yar, ay sarı seyranı yar,
Çəmən, çiçəkdir, oğlan.
Maralı ceyranı yar, maralı ceyranı yar.

## ALA GÜLBƏNGİ, ALA GÜLBƏNGİ

Əmim oğlu olasan,
Ala gülbəngi, ala gülbəngi.
Mənə bir şal alasan.
Ala belinə dola gülbəngi.
Hörəm töküm belinə,
Ala gülbəngi, ala gülbəngi,
Görəndə şad olasan.
Ala belinə dola gülbəngi.

Əmim oğlu, el oğlu,
Ala gülbəngi, ala gülbəngi,
Evinə dolsun oğru.
Ala belinə dola gülbəngi.
Sən ki məni almadın,
Ala gülbəngi, ala gülbəngi,
Bax, apardı el oğlu.
Ala belinə dola gülbəngi.

Əmim qızı, el qızı,
Ala gülbəngi, ala gülbəngi,
Evinə dolsun quzu.
Ala belinə dola gülbəngi.
Sən ki mənə gəlmədin,
Ala gülbəngi, ala gülbəngi,
Mən də aldım el qızı.
Ala belinə dola gülbəngi.

## U LEYLİSƏN, U LEYLİ, U LEYLİ,

Bulaq başı pıtıraq, u leyli,
U leylisən, u leyli, u leyli,
Yarım gəlsin oturaq.
Canım səndən gileyli, gileyli.
Bir o desin, birni mən, u leyli.
U leylisən, u leyli, u leyli,
Bəlkə günü batıraq, u leyli.
Canım səndən gileyli, gileyli.

Qaya başında təndir, u leyli,
U leylisən, u leyli, u leyli,
Odun gətir gəl yandır, u leyli
Canım səndən gileyli, gileyli.
Dadanmamış kəkliyi, u leyli.
U leylisən, u leyli, u leyli,
Al qoynuna dadandır, u leyli
Canım səndən gileyli, gileyli.

Qayalar dirəm-dirəm, u leyli,
U leylisən, u leyli, u leyli,
Suyu hardan endirəm, u leyli.
Canım səndən gileyli, gileyli.
Ünvanını bilmirəm, u leyli,
U leylisən, u leyli, u leyli,
Məktub yazam göndərəm, u leyli,
Canım səndən gileyli, gileyli.

## NAR QOYDUM LƏNGƏRİYƏ, LƏNGƏRİYƏ

Yarı yolladım özüm,
Nar qoydum ləngəriyə, ləngəriyə,
Allah, mənə bir dözüm.
Dolan gəl pəncəriyə, pəncəriyə.
Yolda yoldaşı qurban,
Nar qoydum ləngəriyə, ləngəriyə.
Evə gələndə özüm.
Dolan gəl pəncəriyə, pəncəriyə.

Yar deyilsən, yalansan,
Nar qoydum ləngəriyə, ləngəriyə,
Canım oda salansan.
Dolan gəl pəncəriyə, pəncəriyə.
Neynirəm dünya malın,
Nar qoydum ləngəriyə, ləngəriyə,
Bir başıma dolansan.
Dolan gəl pəncəriyə, pəncəriyə.

Mən gedirəm ağlama,
Nar qoydum ləngəriyə, ləngəriyə.
Pəncərəni bağlama.
Dolan gəl pəncəriyə, pəncəriyə.
Gedib bəlkə qayıtdım,
Nar qoydum ləngəriyə, ləngəriyə.
Özgəyə bel bağlama.
Dolan gəl pəncəriyə, pəncəriyə.

## DEYİMLƏR

Pompullu ferə, çil toyuq,
Səni çalağan aparsın.
Qoca nənən dalınca
Haray, həşir qoparsın.

Bilirsən o nədi? İlan zəhərini ondan alıb.

Bilirsən o nə kərtənkələdi, bütün ilanlar zəhərini ondan alıb.

## NAZLAMALAR

Verənə şükür, ay Allah,
Könül görənə şükür, ay Allah.
Allahdan fərə istəmişdim,
Xoruz verənə şükür, ay Allah.

A gülüm, gülüm, gül dərim,
Səni bazara göndərim.
Sən bazardan gəlincə,
Özümü daşa döndərim.

Mən sənə qurban,
Sən mənə yox.
Çərçilər gəldi,
Muncuğu çox.
Hər rəngi var,
Qırmızısı yox.

Qızdı, nazdı,
Min tümən azdı.
Gedin gətirin,
Gəlin götürün.

Oğlandı, oxdu,
Bir kürək çoxdu.
Qaldırın atın,
Faydası yoxdu.

Şələsi şəkər,
Qadan alım.
Dədəsinə nökər,
Qadan alım.

Ay gözəl oğlan,
Çıx damda dolan.
Qoy qızlar görsün,
Dərdindən ölsün.

Atın, tutun bu balanı,
Nabata qatın bu balanı.
Atın, tutun, yekəlsin,
Yanına vurun, kökəlsin.

Day, day atım oylağı,
Misri qılınc, bel bağı.
Ağa dayısına yaraşır.
İncili sədəf, qol bağı,
Xanım xalasına yaraşır.

Astanalar torpağı,
Qızılgülün yarpağı.
Balama kəc baxanın
Gözünə bibar yarpağı.

Mamani balam, mamani,
Hanı balamın tumanı?
Tumanı ağac başında,
Dayısıgilin tuşunda.
Dayısı buna neylədi?

Şaltan, şultan eylədi.
Əvəlikdən bağ eylədi,
Qıcıtkandan dağ eylədi.
İtdər gördü, hürüşdü,
Qızlar gördü, gülüşdü.

## OXŞAMALAR

Dağların lalasına,
Gülünə, lalasına.
Mən balama yanaram,
Balam da balasına.

Dağların lalasına,
Gülünə, lalasına.
Mən özüm qurban olum,
Balamın balasına.

Atasının gül balası,
Ürəyinin parası.
Mən səndən doya bilməm,
Şirin yerin harası?

Ay mənim şəkər balam,
Nazımı çəkər balam.
Hamıya ağa olan,
Ataya nökər balam.

Sənə qurban ürəyim,
Sən ay duzum, çörəyim.
Böyü pəhləvan ol,
Sənsən mənim gərəyim.

Səni verənə qurban,
Könül görənə qurban.
Allahdan ferə diləmişdim,
Xoruz verənə qurban.

## BAYATILAR

*Dərd adama güc gələndə, tuşuna həmişə bivec gələndə, mərd ah çəkəndə, namərd güləndə ürəkdən yuxa, könüldən nazik neyləsin – bunları çox düşünürəm. Məni tərpədən hiss-həyəcanı ötürmək üçün əlimə qələmi götürürəm.*

*Bayatı dərdin tərcümanı, hər bir dərdin çarəsi, qəmin eşik qapısıdır. Ordan eşiyə çıxanda adama təmiz hava dəyir, sözlərin lətifliyi kədəri unutdurur. Elə buna görə də bayatıya könül vermişəm.*

Ələmi Gülüseyran*,
Mən qərib sənə heyran.
Vətən əlimdən getdi,
Olmuşam dəli ceyran.

Bağçada tağım ağlar,
Dəymə, yarpağım ağlar.
Sağam, özüm ağlaram,
Ölsəm torpağım ağlar.

Əzizinəm ağlaram,
Qəlbimə daş bağlaram.
Vətən qürbətdə qaldı,
Mən vətənsiz ağlaram.

Ələmi güləmmərəm,
Dərdimi biləmmərəm.
Gözümnən sellər axır,
Əl atıb siləmmirəm.

* Gülüseyran (Çivinli) – kənd adı

Eləmi Quzukəndi*,
Dolandım düzü, kəndi.
Hayıma gəlmədilər,
Tərk etdim Quzukəndi.

Görünən Xozudumu?
Yolların tozudumu?
El köçdü, qaçqın olduq,
Bu, alın yazıdımı?

Nə deyim...
Nə danışım, nə deyim.
El köçdü, qaçqın olduq,
Dərdimi kimə deyim?

Nə yazım...
Nə düşünüm, nə yazım?
Didərginlik qoyarmı,
Gələ baharım, yazım?

Dəmlər ilə yox aram,
Dərdlər ilə mən varam.
Vətən dərdimə dərman,
Mən dərmansız sızlaram.

Damda dirək olarmı?
Şana kürək olarmı?
Bizi köçkün etdilər,
Belə fələk olarmı?

---

* Quzukənd (Xozu) – kənd adı

Əzizim Gülüseyran,
Baxardım heyran-heyran.
Qızları çox gözəldir,
Sanasan xallı ceyran.

Arpagölü sonalı,
Əli əlvan xınalı.
Qocalar qaçqın oldu,
Başları ağ cunalı.

Əzizim Qarabulax*,
Ellərə saldım sorax.
Adamlar qaçqın oldu,
İtəni hardan tapax.

Eli haraylı-ünlü,
Çox gözəldi Çivinli.
Balı pətəkdə qaldı,
Olubdu qaragünlü.

Əzizim Güllücədən*,
Yel əsdi Güllücədən.
Elsiz yetimə döndük,
Qaçqın olan gecədən.

---

* Qarabulax – kənd adı
* Güllücə - kənd adı

Eləmi Ellərkəndi*,
Sevirdi ellər kəndi.
Düşmən bir fitnə saldı,
Dağıtdı Ellərkəndi.

Bu kənd də Balıxlıdı*,
Ayağı çarıxlıdı.
Məni sevən oğlanın
Tayfası Arıxlıdı.

Əzizim Təpəköyə*,
Yağış nur səpə köyə.
Düşmən fitnə-fel qurdu,
Nə oldu Təpəköyə?

Eləmi Şurabada*,
Yol gedir Şurabada.
Düşmənin fitnəsindən,
Verdilər kəndi bada.

Əzizim Ördəkliyə*,
Tər tökdüm köynəkliyə.
Kasıbdı, kamallıdı,
Dəyişməm dövlətliyə.

---

* Ellərkənd – kənd adı
* Balıqlı – kənd adı
* Təpəköy – kənd adı
* Şurabad – kənd adı
* Ördəkli – kənd adı

Əzizinəm Düzkəndə*,
Bizi dərd saldı bəndə.
Əlim uzalı qaldı,
Nə vaxt dönərik kəndə?

Görünən kənd İbişdi*,
Yolum yoxuşa düşdü.
Demə, yuxu görmüşəm,
Ayrılıq çətin işdi.

Qaranamaz*, nə ündü,
Bu gələn ağır gündü.
Hamıyla halallaşaq,
Əl əldən üzən gündü.

Öysüzün* dalı dağlar,
Qarlardan cuna bağlar.
Yolun niyə bağlandı,
Kim gəzir səni, dağlar?

Əzizinəm Bozqala*,
Külək səpdi toz, qala.
Qorxuram həsrət ölək,
Bizdən ancaq söz qala.

---

* Düzkənd – kənd adı
* İbiş – kənd adı
* Qaranamaz – kənd adı
* Öysüz – kənd adı
* Bozqala – kənd adı

Görünən Göllüdümü?*,
Dörd yanı güllüdümü?
Bizə qaçqın deyirlər,
Adımız bəllidimi?!

Təpə saldım, dağ olmadı,
Bağça saldım, bağ olmadı.
Kök saldım, yuva qurdum,
Sevinənim sağ olmadı.

Mən bir qoca çinaram,
Fitnə-feli qanaram.
Əlimnən bir iş gəlməz,
Elə ona yanaram.

Donuram, istim yoxdu,
Yanıram, tüstüm yoxdu.
Vətəndə ölmək üçün,
Aparan dosdum yoxdu.

Bağçada bağı, neynim?
Bostanda tağı, neynim?
Yurdumu viran qoydu,
Dilbilməz yağı, neylim?

Qar yağanda qan eylər,
Çaldaşda* boran eylər.
Yurdum yadlara qaldı,
Ürəyim tufan eylər.

---

* Göllü – kənd adı
* Çaldaş – yer adı

Bu kənd Tezbahardımı?*,
Selə dönən qardımı?
Vətən deyib ağlaram,
Qulaqların kardımı?

Deyirlər ki, ay qardaş,
Çox gözəlmiş Qızıldaş*.
İndi xaraba qalıb,
Mənim də gözümdə yaş.

Eləmi Seldağılana*,
Dərd sirr deyil, saxlama.
Ora gediş-gəliş yox,
Gərək yollar bağlana?

Əzizim Mumuxana*,
Gəl gedək Mumuxana.
Necə qarğış eliyim?
Mumuxanı yıxana.

Ay İlannı, İlannı*,
Düşmənin əli qannı.
Ölən də, itən də biz,
Tutdular bizi qannı.

* Tezbahar – Odaşen (1921-ci ildə köçürülən ermənilər dəyişib)
* Qızıldaş – kənd adı
* Seldağılan – kənd adı
* Mumuxan – kənd adı
* İlannı – kənd adı

Dərdin çoxdu, Musduxlu*,
Bilən yoxdu, Musduxlu.
Həsrətin yaxır məni,
Sanki oxdu, Musduxlu.

Görünən kənd Baxçalı*,
Dörd yanı bağ, bağçalı.
Burda ərənlər vardı,
Varlı, hallı, axçalı.

Əzizim Güllübulağa*,
Gül əkdim hər bucağa.
Güllərim vaxtsız soldu,
Düşdüm eldə sorağa.

Görünən Çaxmaqdımı?*,
Döyülən toxmaqdımı?
Vətənsiz kor etdilər,
Günahım baxmaqdımı?

Əzizim Mağaracığa*,
Yol gedir Mağaracığa.
Qürbət vətənə döndü,
Vətənsiz mən yazığa.

* Musduxlu – kənd adı
* Baxşalı – kənd adı
* Güllübulaq – kənd adı
* Çaxmaq – kənd adı
* Mağaracıq – kənd adı

Bu kənd Qaraçantadı*,
Yükümüz bir xandadı.
Ağbabasız dəliyəm,
Ağlım yenə ondadı.

Hamasa* ağ olaydı,
Dörd yanı bağ olaydı.
Hamasadan çıxanda
Kaş Kərəm* sağ olaydı.

Daşkörpünün* daşdarı,
Gül açıb xaşxaşdarı.
Bizi yurddan eliyən,
Qırılsın qardaşların.

Əzizinəm Düzkəndə*,
Qonaq gedək biz kəndə.
Kənd xaraba qalıbdı,
Necə girək biz kəndə?

Hamasa* yolu fərman,
Torpağı cana dərman.
Qəzadan[1] xəbər gəldi,
Yarı dərd, yarı dərman.

* Qaraçanta – kənd adı
* Hamasa – kənd adı
* Kərəm – Qaçaq Kərəm
* Daşkörpü – kənd adı
* Düzkənd – kənd adı
* Hamasa – Amasiya
[1] Hamasa nahiyəsinin bağlı olduğu Qars qəzası

Eləmi anam səni,
Anıram, anam səni.
Hər dərdimə yananı
Sanıram, anam səni.

Eləmi kəndə sarı,
Üz tutdum kəndə sarı.
Dərd məni bəndə saldı,
Sən yaramı ha sarı.

Eləmi bizim bağlar,
Barını dərən ağlar?!
Vətən deyib sızlasam,
Əynimdə kəfən ağlar.

Alçaq dağ uca olmaz,
Fağırdan xoca olmaz.
Anama qoca demiyin,
Anadan qoca olmaz.

Dərdim bölə bilmirəm,
Dərddən ölə bilmirəm.
Ağbabalı günlərim,
Gələr ələ, bilmirəm?

Hər yetən tikə bilməz,
Gözdən yaş tökə bilməz.
Dərdimi filə desəm,
Heç fil də çəkə bilməz.

Eləmi Bəndivana*,
Ayaq qoy nərdivana.
Məni sənə verməzlər,
Dəli ol, nə divana.

Eləmi yaradana,
Üz tutdum yaradana.
Hamı doğar, böyüdər,
Kişi doğmaz hər ana.

Fələk yıxan düzəlməz,
Dərdimi kimsə bilməz.
Külək qapını açar,
Bəs niyə kimsə gəlməz?

Eləmi çərxi-fələk,
Doldurdun arxı, fələk.
Əl-ayağım bağlayıb,
Döndərdin taxtım, fələk.

Dərddən yar alar məni,
Basdı qaralar məni.
Dilin qılınca dönüb,
Betər yaralar məni.

Eləmi min yaram var,
Sinəm üstə qaram var.
Dərdə baxan ay təbib,
Gör yanmamış haram var?

* Bəndivan – kənd adı

Eləmi naşı əlindən,
Tökmür daşı əlindən.
Sinəm çaylağa döndü,
Gözüm yaşı əlindən.

Eləmi birər-birər,
Dərdimi kimlər görər.
Daha çəkə bilmirəm,
Kimlər dərdimi bölər?

Görünən kəcavədi,
Yükü çəkən dəvədi.
Bu dərdləri çəkən var,
O da mən binəvadı.

Eləmi anam gəlsin,
Dərdimə yanan gəlsin.
Qələm-dəftər götürüb,
Dərdimi sanan gəlsin.

Bura Sultanabaddımı?*,
Yolları abaddımı?
Səni axtaran qızın,
De adı Nabatdımı?

Eləmi qəm qaladı,
Qəm üstdən qəm qaladı.
Köz bağlamış yaramı,
Təzədən qurdaladı.

---

* Sultanabad – kənd adı

Xalça saldım, oturan yox,
Sovqat qoydum, götürən yox.
Vətən mənə qürbət oldu,
Bircə xəbər gətirən yox.

Eləmi anam gəlsin,
Dərdimə yanan gəlsin.
Yarama əlac tapıb
Dərdimi qanan gəlsin.

Eləmi gələnimmi var,
Dərdimi bilənimmi var?
Göz yaşım selə döndü,
Əl atıb silənimmi var?

Çəməndə, ay çəməndə,
Dərd salıbdı kəməndə.
Vətən deyib ağlaram,
Bir o dərd də var məndə.

Düşdük dərdə, azara,
Yoxsa gəldik nazara?
Biz fələyə neylədik?
Yazıbdı bəxti qara.

Göylərdən nur ələndi,
Kədər qəlbi dələndi.
Başlar yerə əyildi,
Gözlərdən yaş çiləndi.

Şəhid olan qərənfil,
Saçın yolan qərənfil.
Şəhidin qəbri üstə,
Vaxtsız solan qərənfil.

Məndə dərdin əsarı,
Çəkmişəm qəm hasarı.
Bu yara heç sağalmaz,
Gecə-gündüz ha sarı.

Əzizim ağlar gözüm,
Söz qoşdum düzüm-düzüm.
Xiyabana girəndə
Qurtarır bütün sözüm.

Xiyaban qəm karvanı,
Karvan, sarvanı hanı?
Qibləgahdı yaxşı bil,
Bu yeri yaxşı tanı.

Əzizinəm sən də gəl,
Dolan düzü sən də gəl.
Bura müqəddəs yerdi,
Xiyabana sən də gəl.

Ay qərənfil, solma sən,
Saçlarını yolma sən.
Gəl gedək toy evinə,
Xiyabanda qalma sən.

Xiyabanda Süsən var,
Toy evindən küsən var.
Xiyabandan getmərəm,
Burda İlqar, Süsən var*.

Dərdim çoxdu, ay ellər,
Soldu əkdiyim güllər.
Məni yandırıb-yaxır,
Dediyiniz o dillər.

Eləmi qara baxtım,
Gülmədi qara baxtım.
İyirmi Yanvar günündə
Qan yağan qara baxdım.

Eləmi qara baxdım,
Çəkilib dara baxdım.
Kor olmadı gözlərim,
Tapmadım çara, baxdım.

Eləmi gəlin anam,
Dərdini bilim, anam.
Təki sən səslə məni,
Tez qaçıb gəlim, anam.

Aldatdı fələk, atam,
Elədi kələk, atam.
İllərlə zəhmət çəkdin,
Apardı külək, atam.

* Şəhidlər xiyabanı nəzərdə tutulur

Ana-bacısız anam,
Dərd vurur, gərək yanam.
Ağbaba çıxdı əldən,
Xaraba qaldı xanam.

Eləmi haray səni,
Ucaltdım saray səni.
Qoyma yollarda məni,
Gəl görüm hər ay səni.

Əzizim kimə gedim?
Kimim var, kimə gedim?
Ay dərd verən Allahım,
Dərmana kimə gedim?

Aləmin dərdi məndə,
Dərdi de dərdiməndə.
Loğman buna neyləsin?
Tapammır dərdi məndə.

Eləmi daşım ağlar,
Torpağım, daşım ağlar.
El didərgini oldum,
Ürəyim başı ağlar.

Ağbaba ağlamazmı?
Qar yolu bağlamazmı?
Elindən ayrı düşən
Hər gecə ağlamazmı?

Hamasa ələmlidi,
Dörd yanı qələmlidi.
Vətənin qoyub gələnin
Ürəyi vərəmlidi.

Əzizinəm bir də gəl,
Sonam, gölə bir də gəl.
Düşmən vətəni aldı,
Olammadıq biz əngəl.

Damda dirək olarmı?
Şana kürək olarmı?
Mən didərgin düşmüşəm,
Məndə ürək olarmı?

Orda bir binə saldım,
Qapısını günə saldım.
Külüng vurdum, bel qırdım,
Bilmədim kimə saldım.

Təndirim həb-həb oldu,
Ürəyim kabab oldu.
Mən vətəndən gəlməzdim,
Qarabağ səbəb oldu.

Ölürəm, üstümə gəl,
Yanıram, tüstümə gəl.
Sağlığımda gəlmədin,
Məzarım üstünə gəl.

Ay mənim gözəl anam,
Bir dikəl qalx, gəl, anam.
Çarə tapa bilmədik,
Apardı əcəl, anam.

Bağçada bar olaydım,
Alma yox, nar olaydım.
Ürək atəşdən yandı,
Bir ovuc qar olaydım!

Xörək isti, gəl apar,
Olmaram əngəl, apar.
Anam sevir xəşili,
Bir az da xəngəl apar.

Nökərin olum, ana,
Dəyişməz yolum, ana.
İstəyirəm boynuna
Sarılsın qolum, ana.

Sinəsi sazdı anam,
Dodağı sözdü anam.
Əzrayıla gəl – dedi,
Canından bezdi anam.

Kotanı qoş dedilər,
Dağları aş dedilər.
Qarı düşmən dost olmaz,
Başın al, qaç dedilər.

Dağlardan aşan gəlsin,
Qaynıyıb coşan gəlsin.
Haray çəkdim ellərə,
Ürəyi şan-şan gəlsin.

Atının nalı ollam,
Başının şalı ollam.
Ağbabanın torpağı,
Dağının yalı ollam.

Eləmi paralandım,
Elimdən aralandım.
Ox atsalar ölməzdim,
Bir sözdən yaralandım.

Əzizinəm sən də gəl,
Dumanda gəl, çəndə gəl.
Qürbətdə can verərəm,
Barı mən köçəndə gəl.

Əzizinəm sən də gəl,
Hamı gəldi, sən də gəl.
Əzrayıl canım aldı,
Loğman olmadı əngəl.

Fələyin izi qannı,
Torpağı, düzü qannı.
Dağılan vətən mənim,
Tutdular bizi qannı.

Ay hazara, hazara,
Təndir yanıb qızara.
Əldən getdi Ağbaba,
Düşdük dərdə, azara.

Çeşmə gördüm, içən yox,
Zəmi gördüm, biçən yox.
Üz tutdum, vətən sarı,
Niyə burdan keçən yox?

Çeşmə, suyun qurumuş,
Zəmi, barın çürümüş.
Kor olasan, gözlərim,
Sənin bəxtin kor imiş!

Sonalar göldə qaldı,
Taxılı çöldə qaldı.
Elə ona yanıram,
Dərdimiz dildə qaldı.

Eləmi dərdi mənə,
Dərmansız dərdimənə.
Fələyə neylədim ki,
Çəkdirir dərdi mənə?

Bütün ömrüm talandı,
Dərd üstə dərd qalandı.
Dünyada yardan başqa
Qalan hamsı yalandı.

Əzizim nərdivana,
Ayaq qoy nərdivana.
Mən fələyə neylədim,
Fələk etdi divana.

Hanı bizim o bağlar,
Ürəyim qubar bağlar.
Vətəndən ayrı düşdüm,
Gözlərim hey qan ağlar.

Tirmə şalın var sənin,
Dodaqların bal sənin.
Bu qədər yalvarıram,
Niyə dilin lal sənin.

Əzizinəm bu dağda,
Bülbül ötər bu bağda.
Heç sağalan gördünmü
Bu yaradan, bu dağdan?

Əzizim günə qarşı,
Baca qoy Günə qarşı.
Qəribin naləsi var,
Axşamdan günə qarşı.

Əzizim bildir, bildir,
Dərdini mənə bildir.
Qərib vətəni anar,
Göz yaşı bildir-bildir.

Mənə “Yeraz” dedilər,
Bu dərdin az, – dedilər.
Yersiz, yurdsuz adama
Gələrmi yaz, – dedilər.

Eləmi “Yerazam” mən,
Sevinci çox azam mən.
Dərd əlindən ötənin
Əlindəki sazam mən.

Eləmi qarrı dağlar,
Bağçalı, barrı dağlar.
Elindən ayrı düşsən,
Ürəyin qubar bağlar.

Eləmi hazaram mən,
Dərdlərdən bezaram mən.
Düşmənimin, ay ellər,
Qəbrini qazaram mən.

Yel kimi əsirəm mən,
Hamıdan küsürəm mən.
Vətənçün xəstə düşdüm,
Dərdlərə əsirəm mən.

Göydə ulduz görmüşəm,
Saçın ucun hörmüşəm.
Vətən əlimnən getdi,
Elə bil ki, ölmüşəm.

Eləmi yanar canım,
Hər dərdi qanar canım.
Sarıqamış* deyəndə
Damarda donar qanım.

Əzizinəm güləm mən,
Bülbül deyən güləm mən.
Mən didərgin düşmüşəm,
Çətin bir də güləm mən.

Dağ döşündə qar idim,
Mən ki sənə yar idim.
Niyə atdın məni sən?
Yoxsamı mən kor idim?!

Dağ döşündə gül idim,
Oxuyan bülbül idim.
Niyə atdın məni sən?
Yoxsamı mən lal idim.

Dağ döşündə gül bağlar,
Hərə bir dəstə bağlar.
Yar tərəfdən atılan
Hər gecə yalqız ağlar.

Kim gələr...
Kimim var ki, kim gələr.
Qərib köçsə dünyadan
Ağlamağa kim gələr?

---

* Sarıqamış – I Dünya müharibəsi zamanı türk əsgərlərinin donaraq şəhid olduqları məkan

Sel oldu...
Qar əridi sel oldu.
Yarı yardan eliyən
Acı-acı dil oldu.

Yağa-yağa göl oldum,
Axa-axa sel oldum.
Dərdi içimə saldım,
Axır dönüb lal oldum.

Eləmi dinmiyimmi*,
Qəmnən don geymiyimmi?
Zəlzələ cannar aldı,
Bə ağı demiyimmi?

Eləmi məzar oldu*,
Hər kəsə azar oldu.
Bu yıxılan yuvalar
Çoxuna məzar oldu.

Eləmi aça bilməm*,
Dərd, sənnən qaça bilməm.
Zəlzələ viran qoydu,
Heç hara qaça bilməm.

* İstanbulda baş verən zəlzələ
* İstanbulda baş verən zəlzələ
* İstanbulda baş verən zəlzələ

Eləmi ay xanalar*,
Qurulan bərxanalar.
Ağlayıb haray çəkər
Uçqunlarda analar.

Eləmi bağça sənnən,
Bağ mənnən, bağça sənnən.
Yurdumnan bir xəbər ver,
Qızıl pul, axça sənnən.

Eləmi dilim laldı,
Quruyub dilim laldı.
Məni dinməz eliyən
Səndəki qoşa xaldı.

Eləmi bilə-bilə,
Yanıram bilə-bilə.
Balama qalxan oldum,
Külümü silə-silə.

Eləmi gərəyimsən,
Yıxılmaz kürəyimsən.
Yağı yıxan evimi
Qaldıran dirəyimsən.

Eləmi xana-xana,
Yuva var xana-xana.
Yuvam yadlara qaldı,
Mənə düşdü qəmxana.

* İstanbulda baş verən zəlzələ

Eləmi aman vermə,
Yağıya aman vermə.
Yad gələr, yuvan yıxar,
Gəlməyə güman vermə.

Eləmi aşan gəlsin,
Dağları aşan gəlsin.
Məniynən deyişməyə,
Dərdlərdən coşan gəlsin.

Eləmi külüm qaldı,
Alışdım, külüm qaldı.
Harayıma kim gələr?
Ağzımda dilim laldı.

Eləmi düzüm sənsən,
Söhbətim, sözüm sənsən.
Zülmət qalan dünyama,
Açılan gözüm sənsən.

Yəməni, ay Yəməni,
Nəzir dedim səməni.
Gedən niyə gəlmədi?
Göyərmədi səməni.

Göydə bulud çən salar,
Yağar, yerə nəm salar.
Yurdundan ayrı düşən
Vaxt, vədəsiz qocalar.

Əzizim uca dağlar,
Hamıdan qoca dağlar.
Qəribin nalə səsi,
Gör, səni necə dağlar.

Ay Baxçalı, Baxçalı,
Fələk eylədi alı.
Bir də görə bilmərəm
O yamacı, o yalı.

Çayır çəmən oldu, gəl,
Gül yasəmən oldu, gəl.
Yollarına baxmaqdan
Ürəyim qan oldu, gəl.

Kol dibində bənövşə,
Boynun bükər həmişə.
Zülm ilə böyüdərsən,
Yadın olar, nə işsə.

Quzeydəki ağ qardı,
Yemiş əkdim, nübardı.
Əziyyətlə böyütdüm,
Yad qızları apardı.

Göydə ulduz gördüm mən,
Dərdin dilin bildim mən.
Çağırdım, gəlmədin sən,
Elə o gün öldüm mən.

Bağa bağban olaram,
Güllərini sularam.
Balam qürbətə getsə,
Hər gün məktub yollaram.

Bağa bağban olaram,
Alaq otun yolaram.
Övladımı görməsəm,
Mən gül kimi solaram.

Təndir tüstü tütəndə,
Qərib quşlar ötəndə.
Kəfənim qoltuğumda,
Gözüm qaldı vətəndə.

Kündəm düşdü, təndir ver,
Çay süzmüşəm, qəndi ver.
Köçüm yola düzüldü,
Nolar, bizim kəndi ver.

Ay dağlar, qoca dağlar,
Hər dağdan uca dağlar.
Qərib vətənsiz ölsə,
Naləsi sizi dağlar.

Şaftalı çiçəkləndi,
Dörd yanı ləçəkləndi.
Qız, gözün aydın olsun,
Toyunuz gerçəkləndi.

Sandıq üstə səməni,
Gül bürüdü çəməni.
Mən səni çox sevmişəm,
Elçi göndər, al məni.

Bulud dolub, qar yoxdu,
Gecə keçib, yar yoxdu.
Gözüm yollarda qaldı,
Niyə bir xəbər yoxdu?

Dərdli dilin bilmirsən,
Çağırıram gəlmirsən.
Göz yaşım selə döndü,
Gözlərimi silmirsən?

Bu da məni...
Bəyənmir bu da məni.
Bar verməz ağac oldum,
Nolar, gəl, buda məni.

Əzizim Təkgüneydə*,
Maral var Təkgüneydə.
Düşmən məni kül etdi,
Quzeydəyəm, Güneydə?!

Əzizinəm çən gələ,
Yağış yağa, çən gələ.
Mən elimi satmaram,
Çəksələr də çəngələ.

---

* Təkgüney – yer adı

Balım pətəkdə qaldı,
Yarma dibəkdə* qaldı.
Ayaqyalın, başaçıq,
Görən deyir nə haldı?

Təndir atəşdə qaldı,
Xəmirim teştdə qaldı.
Yağı gəldi, biz qaçdıq,
Onçun dilimiz laldı.

Dağların arasına,
Heyranam lalasına.
Mən kimi ana qurban,
Şəhidin balasına.

Qəmi olan hey ağlar,
Başına qara bağlar.
Barın yağıya qaldı,
Viran olsan, a bağlar.

Yenə məni...
Dindirir yenə məni.
Bir alimə qul oldum,
Gətirdi dinə məni.

Haqqa güman aradım,
Dində iman aradım.
Əlimi Allaha açdım,
Onda aman aradım.

---

* Dibək – yarma döymək üçün içi oyulmuş daş

Günahımı ölç, – dedim,
Mənə kəfən biç, – dedim.
Yaxşılarına xətrinə,
Günahımdan keç, – dedim.

Çox vədəsiz qocaldım,
Dərdlərimdən güc aldım.
Dərdlərim kürəyimdə,
Qocaldıqca ucaldım.

Dağlar gördüm, qarı yox,
Bağlar gördüm, barı yox.
Dava salan, öləsən,
Gəlin gördüm, yarı yox.

Getmişdim Ördəkliyə*,
Tər tökdüm köynəkliyə.
Kasıbdı, kamallıdı,
Dəyişməm dövlətliyə.

Kəmər taxdım belimə,
Qar tez yağdı telimə.
Yağılar ayaq açdı,
Bəla gəldi elimə.

Allah, güvəndim sana,
Bir halıma baxsana.
Məni qaçqın salanın
Evini sən yıxsana!

* Ördəkli – kənd adı

Eləmi Seldağılan,
Gözəlmiş Seldağılan.
Gör nə fitnələr düşdü,
Dağıldı Seldağılan.

Enmədim Sarıdağdan*,
Düşmən gəldi qabaxdan.
Düşdüm qaçqın, didərgin,
Ah çəkirəm o vaxtdan.

Utan, ay fələk, utan,
Pislərdi kama çatan.
Hanı o Ağbabada
Mənsil alıb, yağ tutan.

Bu kənd nədən İbişdi*,
Yolum yoxuşa düşdü.
İstədim yarı qucam,
Əlim saça ilişdi.

Quzukənddə quzu var,
Duzlaqda da duzu var.
Dərd deyilən bir deyil,
Bu sinəmdə yüzü var.

Tağ altında şamama,
Həsrət qaldım obama.
Bu necə bayquşdu ki,
Sahib çıxdı obama.

---

* Sarıdağ – dağ adı
* İbiş – kənd adı

Erməni, ay erməni,
Əydi bu zülüm məni.
Qisasımı almasam,
Gözləsin ölüm məni.

Öməröləndimi* bu,
Dərdim biləndimi bu?
Ha çağırıram gəlmir,
Haya gələndimi bu?

Qaçaq Usuf* atdandı,
Patronu beş qatdandı.
Qan dolubdu dizinə,
Elə bilir otdandı.

Dağlar qarsızmı olar,
Su lilparsızmı olar.
Fələk, mərdi sındırdın,
İgid arsızmı olar?

Dərdimi dərdlə sardım,
Dərdə, qəmə hasardım.
Dərddən hər ağlayanın
Yarasını mən sardım.

Yaram qaysaq bağladı,
Gözlərim qan ağladı.
Yağı didərgin saldı,
Ürəyimi dağladı.

---

* Öməröln – yer adı
* Qaçaq Usuf – Göllülü məşhur qaçaq

Dağlanan ürək oldum,
Hamıya gərək oldum.
Qaçqına qapı açdım,
Aclara çörək oldum.

Açılan qapı oldum,
Bulud kimi mən doldum.
Vətən həsrəti ilə
Aşıb-daşan sel oldum.

Bizi selə verdilər,
Yurdu ələ verdilər.
Günahkar ortada yox,
Bilə-bilə verdilər.

Dərdimiz yaman oldu,
Ahımız duman oldu.
Yaram çətin sağala,
Dərmanı zaman oldu.

Əynimdəki kəfəndi,
Dərdlər məndən ötəndi?
Mənim dərdim sağalmaz,
Dərdə dərman vətəndi.

Əzizinəm, dərdi nə?
Dərdini de dərdinə.
Ha dindirirsən dinmir,
Kaş biləsən dərdi nə?

Əzizinəm güləsən,
Su verirsən gülə sən.
Allahdan dilərəm ki,
Ağlamayıb güləsən.

Əzizinəm, beşdimi?
Burdan karvan keşdimi?
Bu qədər can yandırdım,
Gəlin ömrüm heşdimi?

Əzizinəm, mərdana,
Ər böyüdər mərd ana.
Ömrümü qurban etdim,
Qədirbilməz nadana.

Əzizinəm, nə deyim,
Nə danışım, nə deyim.
Yurdum yağıya qaldı.
Bilmirəm ki, nə deyim.

Dərd məni...
Nə tez tapdı dərd məni.
Düşmən yıxa bilmədi,
Axır yıxdı dərd məni.

Əzizinəm daşdımı,
Dərd başından aşdımı.
İki əlim yaxanda
Göydən yağan daşdımı?

Əzizinəm Bozqala,
Külək əsə, toz qala.
Qorxuram həsrət ölək
Bizdən ancaq söz qala.

Buludlar qaralıbdı,
Vədələr daralıbdı.
Səndən mənə, ay qardaş,
Acı dərdlər qalıbdı.

Mən aşıq beləsinə,
Yuvam var beləsinə.
Bütün dünyanı gəzsəm,
Rast gəlməm beləsinə.

Gül əkdim, kol vermədi,
Saraldı, gül vermədi.
İstədim kəndə dönəm,
Düşmənim yol vermədi.

Düşmən başlar kəsəndi,
Tale bizdən küsəndi.
Qardaş, qorxduğum tufan,
Şimal yöndən əsəndi.

Dağ-daş qana boyandı,
Quzğun qandan doyandı?
Mən düşməni boğardım,
Yağı ona hayandı.

Verilən fərmandımı?
Dərdlərə dərmandımı?
Çarəsiz dərdə düşdük,
Hər yetən loğmandımı?

Qan-qada dizə çıxıb,
Gedib Təbrizə çıxıb.
Allah bəxt paylayanda,
Bədbəxtlik bizə çıxıb.

Yollarından azdılar,
Bizi yola düzdülər.
Haqqımızı istədik,
"Didərginlik" yazdılar.

Dəsmal alıb ağladım,
Yaralarım bağladım.
Vətən sağalmaz dərdim,
Ürəyimdə saxladım.

Eləmi bilə bilməm,
Gözümü silə bilməm.
Əlim daşın altında,
Mən durub gələ bilməm.

Eləmi bəndə düşdüm,
Axır kəməndə düşdüm.
Elim əlimdən getdi,
Qürbətə mən də düşdüm.

Dərdə dərman aradım,
Doğru fərman aradım.
Fərman daşa dönübdü,
Haqdan güman aradım.

Məhlə-məhlə gəzdilər,
Əlimizdən bezdilər.
Qaçqın, didərgin deyib,
Təzə tale yazdılar.

Dərddən, qəmdən yoruldum,
Dərdlərə loğman oldum.
Kəndi viran qoydular,
Virana bağban oldum.

Qəmi qəmə caladım,
Qəmnən ocaq qaladım.
Yanıb kösövə döndüm,
Külümü qurcaladım.

Dərdliyə dərman oldum,
Aləmə loğman oldum.
Özümə sıra çatdı,
Hamıdan mağmın oldum.

Kül altında atəş var,
Qurcalasan od olar.
Vətən üçün yanaram,
Bir ovuc külüm qalar.

Qəmdən qəmə yol aldım,
Yoruldum, yolda qaldım.
Qəmlər belimi bükdü,
Qəmdən vaxtsız qocaldım.

Qəmi qəmə bağlama,
Qəm əlindən ağlama.
Gələr bir gün qəm keçər,
Başa qara bağlama.

Ağlamayım, neyləyim?
Qəmim kimə söyləyim?
Vətən yadlara qaldı,
Qəm gölündə üzməyim?!

Qürbət qəriblər üçün,
Ağlaram için-için.
Bala, qapıda qaldım,
Nə vaxt görünər köçün?

Uzaqdan gələnmi var?
Dərdimi bilənmi var?
Balam qürbətdə qaldı,
Yanından gələnmi var?!

Bir yaralı quşam mən,
Yuvamda qalmışam mən.
Nə gələn var, nə gedən,
Təklikdən bezmişəm mən.

Qocalıq belim büküb,
Taleyim məndən küsüb.
Əlim çatmır balama,
Əzrayıl yolu kəsib.

Xəstə qalmaz loğmansız,
Təbib olmaz dərmansız.
Ellərə loğman oldum,
Özüm öldüm dərmansız.

Dağda bağ olaydım,
Bostanda tağ olaydım.
Vətənin xoş günündə
Ölməyib sağ olaydım.

Vətən uzaqda qaldı,
Dərd məni bəndə saldı.
O qədər qorxutdular,
Ağzımda dilim laldı.

Sızlayan yarandımı?
Məlhəmi badamdımı?
Hər kəs adam cildində,
Hamısı adamdımı?

Bir qoca çinaram mən,
Keçmişi anaram mən.
Balalarımdan ötrü,
Hər oda yanaram mən.

Sızıldayan yarayam,
Kömək çağıran harayam.
İllərlə zəhmət çəkdim,
İndi uçan sarayam.

Kimə deyim...
Kimim var, kimə deyim.
Məni sən anlamazsan,
Dərdimi kimə deyim.

Kim gələr...
Kimsəsizə kim gələr?
Qəribin qəbri üstə
Kimsəsizdi, kim gələr?

Qərib qəbri qazıldı,
Alnına bu yazıldı.
Qəribin baş daşına
"Kimsəsizdi", – yazıldı.

Dərdə niyə tuşam mən?
Haray verən quşam mən.
Dərd məni yaman yorub,
Dərddən yoğrulmuşam mən.

Kim gələ...
Kimim var ki, kim gələ
Yuvam yadlara qaldı
Barı dərdim kəm gələ.

Təndirim həb-həb oldu,
Ürəyim kabab oldu.
Mən didərgin düşmüşəm,
Erməni səbəb oldu.

Əlindəki sazam mən,
Bəxti bağlı qızam mən.
Vətən yolu bağlıdı,
Çətin buna dözəm mən.

Oğlan, adın Turaldı,
Heyva bağda saraldı.
Dedin: – səhər gələrəm,
Gözüm yollarda qaldı.

Ay qız, adın Fatmadı,
Ay buludda batmadı.
Dedim – səhər gələrəm,
Neynim, vaxtım çatmadı.

Ay buludda batarmı?
Yarım sənsiz yatarmı?
Qapıdan səslər gəlir,
Məni köçürən qatarmı?

Mən sevdalı bir quşam,
Təzə yuva qurmuşam.
Əlini ver əlimə,
Alnına yazılmışam.

Yazı yazana qurban,
Yazıb yozana qurban.
Sən alnımın yazısı,
Mənə yazana qurban.

Əzizinəm, açarmı,
Dərdli məndən qaçarmı?
Yolum yaman bağlanıb,
Kimsə onu açarmı?

Dərdlər qəlbimi deşdi,
İşim müşkülə düşdü.
Bağlayan bərk bağlayıb,
Düyün quyuya düşdü.

Bizə qulaq asdılar?
Yolumuzu kəsdilər.
Qaysaqlanmış yaraya
Təzədən duz basdılar.

Qocalıq belimi büküb,
Taleyim məndən küsüb.
Balama əlim çatmır,
Əzrayıl yolum kəsib.

Halımı bilənmi var?
Yaşımı silənmi var?
Əzrayıla can verməm,
Qürbətdən gələnmi var?

Bala ananı yanlar,
Balam məni tez anlar.
Məhəbbəti yazıbdı,
Bizə yazı yazanlar.

Dərdim məni dərdə saldı,
Dərd çəkməkdən dilim laldı.
Ha istədim dərdimi deyəm
Qabağını dərdim aldı.

Dərdimi dedim dərdimə,
Dərdlərin mənnən dərdi nə?
Fələk əlini uzatsa
Dərman eylər dərdimə.

Dərd məni dərdə saldı,
Dinmədim, dilim laldı.
Sevinci apardılar,
Qəmləri mənə qaldı.

Bir alınmaz qalayam,
Bir bərəydim dolaydım,
Bir arzum var dünyada,
Sənə qurban olaydım.!

Qəm üstə qəm çəkirəm,
Qəmdən bostan əkirəm.
Bostana dən yerinə,
Qəmlərimi tökürəm.

Tənhayam, qəm çəkirəm,
Buluddan nəm çəkirəm.
Hayıma kimsə gəlməz,
Göz yaşımı tökürəm.

Göz yaşım gilə-gilə,
Tökürəm qızılgülə.
Dərdimə dərman olmaz,
Ölürəm bilə-bilə.

Qəbrimdə gül əkərlər,
Zəhmətini çəkərlər.
Məni yada salanda
Dərdəmi göz dikərlər?

Xoruz ban verdimi?
Yaran da qan verdimi?
Balasını gözləyən,
Əcələ can verdimi?

Qardaşım daşa dönüb,
Gözündə yaşa dönüb.
Köç edib, qayıtmayan,
Bir qərib quşa dönüb.

Qürbət qəriblər üçün,
Ağlaram için-için.
Bala, qapıda qaldım,
Nə vaxt görünər köçün?

Uzaqdan gələnmi var?
Dərdimi bilənmi var?
Görən kimdi ağlayan,
İtən, ya ölənmi var?

Bir yaralı quşaqm mən,
Dərdə-qəmə tuşam mən.
Nə gələn var, nə gedən,
Təklikdə bezmişəm mən.

Gecə düşdü qaranlıq,
Yuxuladım bir anlıq,
Yuxum ərşə çəkildi,
Hardasan, ay cavanlıq!

Qəm gəlir qoşuna bax,
Atdığı daşına bax!
Günüm döndü gecəyə,
Fələyin işinə baz!

Sinəm dərdə yurdu olub,
Mən çəkdiyim dərd olub.
Dünyanın işinə bax,
Çaqqallar da qurd olub?!

# ŞEİRLƏR

## ŞƏHİDLƏR XİYABANI

Üzü duvaxlı qəbirlər
Gör nələr... nələr deyirlər.
Əl-ələ tutan aşiqlər
Burda əhd-peymana gəlirlər...

“Fərizə-İlham” dastanı
Vərəqlənir burda,
Quşlar da oxumur,
Yas saxlayır burda.

Əli xına görməmiş,
Toy səsi eşitməmiş,
Bəy otağına girməmiş
Pəhləvanlar yatır burda!

Güllər açılmamış solmuş,
Analar saçın yolmuş,
Sevənləri yolda qalmış
Oğullar yatır burda.

Bala dadı görməmiş,
Körpə saçı hörməmiş,
Layla, – deyib sevməmiş
Analar yatır burda.

Sonalar qanad çalır,
Durnalar lələk salır,
İnsan xəyala dalır,
Göz yaşım sel olur burda.

Qərənfillər qan yaşım,
Xiyaban daş yaddaşım,
Azadlıq son sirdaşım,
Təsəllim olur burda!

## XOCALI – HARAYIMIZ...

Xocalı – hayqıran harayımızdı,
Xocalı – yıxılan sarayımızdı.
Xocalı – qisas bağıran arımızdı...
Mən bu arsızlığa daha dözə bilmirəm.

Xocalı – bəşəriyyət üçün vəhşilik,
Xocalı – nadanlar üçün adilik.
Xocalı – anlayan üçün namusdu,
Mən bu namussuzluğa daha dözə bilmirəm!

Leksikonunda “namus” sözü olmayanlar,
“Qeyrət” sözünü qanmayanlar,
Vətən üçün yanmayanlar...
Mən onlarla bir sırada daha dura bilmirəm.

Xocalı – gerçəyə çatmayan əlimiz,
Xocalı – gerçəyi anlada bilməyən dilimiz,
Xocalı – ölüb-dirilən hər birimiz...
Mən diriykən daha ölü kimi gəzə bilmirəm.

Yetər! Kar qulaqlar açılsın!
Həqiqətlər hər tərəfə günəş kimi saçılsın!
Düyünlənmiş bütün düyünlər açılsın,
Mən həqiqətin qələbəsini görmədən
Ölə bilmirəm!

## ATA, SƏNİ ÖZLƏDİM

Ata!
Mən səni çox özlədim,
Amma çox özlədim...
Gözüm yol çəkircəsinə
Öldüyünü unudub
Səni gözlədim...
Qapı cırıldayanda
Diksindim..
Elə bildim sən gəlirsən.
Gözümdə gizlənən
Yaşlarımı silirsən.
On iki ildir getmisən,
Elə bilirəm dünən köçmüsən.
Axı mən ürəyimdə həmişə
Səninlə danışıram;
Qəmimi gizləyib
Sevincimi sənlə bölürəm.
Xəyallarımda həmişə
Sənin yanında ölürəm!

## NƏRGİZ

Nərgiz mənim quzumdu,
İstiotumdu, duzumdu.
Hamıdan ağıllıdı,
Muncuqgözlü qızımdı.
Yeriyir asta-asta,
Danışır usta-usta
Hamıya gülümsəyən
Gülərüzlü qızımdı.
Kəpənək kimi uçan qızım;
Anasının dalınca qaçan qızım,
Hirslənəndə tez küsən,
Barışmağın haçan, qızım?

## "BAŞ SARITEL" DİNLƏYƏRKƏN

Aşıq, mizrabı vurma simə
Ürəyim gedir.
Hislərim yaşa dönüb
Gözümnən gedir...
Geri dönüb arxaya baxıram...
Qiymətli nəyim varsa
Bir-bir əlimnən gedir...
Hanı mənim el yaraşığı
Mələk misallı atam?
Hanı mənim sinəsi sazdı,
Dodağı sözdü,
Ağzı yaşmaqlı anam?
Niyə tələsdilər?..
Aya dönüb, günə dönüb

Dağdan aşdılar –
Dünyanı tərk etdilər,
Məni qəmə qərq etdilər.

***24.12.2009***

## DƏRDLİ ANLAR – QIRIQ MİSRALAR

1.
Halıma yananım yox,
Dərdimi qananım yox!
Kimsəsiz adada
Yalqız, yalqız qalmışam,
Ürəyim, mən səni dinlədim,
Məni dinləyənim yox!

2.
Məcnunun dərdinə ağlayan canım.
Leyliyə yas saxlayan canım,
Çöldə kəpənək qovlayan canım –
Yanıb, yanıb
Külə döndü...
Öz dibinə işıq salmayan
Şama döndü.

3.
Hərdən xəyallara dalıram
Qaranlıq bir quyunun
dibində qalıram.
Birdən qaranlığım
İlahi bir güclə nurlanır:
Qaranlığımdan sabaha
Bir ümid boylanır.

## DÜŞÜNCƏLƏR

1.
Gecələr uzadır əllərini
Səhərə sarı
Əlacsız dərdlərimizin
Tərcümanı...
Günləri yumaq kimi
Üst-üstə sarı ha, sarı.
Könlüm çəkib özünə
Qəmnən hasarı.
Dərd anlayan,
Hal bilən
Aşa bilərmi hasarı.

Eləmi naşı əlinnən,
Tökmür daşı əlinnən.
Dəryalar ümman oldu,
Gözüm yaşı əlinnən.

Xoş söz çıxmaz dilinnən,
Yaxşılıq gəlməz əlinnən.
Çətin ki qurtara billəm
Fitnəsinnən, felinnən

2.
Göy üzünü aldı buludlar
Nələri yadıma saldı buludlar.
Bənzətdim onu dağ ceyranına,
Elə bil belində xaldı buludlar

Dindirsən, dinə bilməyir;
Ağlasan gözünü silə bilməyir.
Hər yerə uçur gedir, dinə
bilməyir,
Görəsən niyə laldı buludlar?

## ŞÜKRANLIQ

Həyatıma qibtə ilə
baxanlar var;
Taleyimə həsəd
aparanlar var;
İçim özümü yandırır,
Çölüm başqalarını qandırır.
Yerimdə olmaq
istəyənlər var,
Naşükürlük etmək olmaz.
Allahın lütfü
Gül balalarım.
Şirin-şəkər nəvələrim,
Gözəl, göyçək gəlinlərim.
İşim, gücüm
Evim, eşiyim.
Yırğalanan beşiyim,
Təhnə dolu çörəyim...
Şükür sənə Allahım,
Daha sənnən nə istəyim?!

## ATAMIN ƏRKÖYÜN BALASI

Əzizinəm, ay qardaş,
Qaşın ucu yay, qardaş.
Ölsə, bacılar ölsün
Heç deməsin, vay, qardaş.

Mənə "vay" dedirtdin, qardaş,
Ürəyimə xəncəri yeritdin, qardaş.
Göz yaşım selə döndü,
Məni xatirələrinlə kiritdin, qardaş.
Əlimi uzadıram, çata bilmirəm,
Həsrətindən gecələr yata bilmirəm.
Bu qədər dərd çəkirəm, niyə ölmürəm?
Bu sirri sən mənə sən anlat, qardaş.

Mənə sirdaş sən idin,
Dərdə yoldaş sən idin.
Dar günümdə var idin,
Gen gündə niyə yoxsan, qardaş?

Göz yaşım od olub yandırır məni,
Soyuq baxışlar dondurur məni,
Günün günorta çağı əli çıraqlı
Axtarıram, niyə gəlmirsən, qardaş?
Sən atamın ərkəsöyün balası,
Ay anamın ciyərparası,
Sən dağların bağrı qanlı lalası,
Sənə qurban gözlərimin qarası.
Dostundan düşmənli, qardaş,
Niyə olmadın sən mənə sirdaş?

Birini söylədinsə, birin saxladın,
Niyə dərdini demədin, qardaş?

Eləmi dərdi məndə,
Dərdi de, dərdiməndə.
Mən fələyə neylədim?
Dərmansız dərdi məndə.

Dərmansız dərdinə dərman olmadıq,
Fələkdən ömrünə beş gün çalmadıq.
Bircə gün yanında gəlib qalmadıq,
Nədən bu qədər uzağıq, qardaş.
Nədənlərə cavab tapa bilmirəm,
Xatirələrdən qopa bilmirəm.
Ha qaçıram, sənə çata bilmirəm,
Niyə yolun uzaqdı, qardaş.
Qərarımızı sən pozdun, qardaş,
Bu qədər dərdə sən dözdün, qardaş.
Filə yükləsəydin çəkə bilməzdi,
Bə sən niyə çəkirdin, qardaş?!

***

Özümün özümə yazığım gəlir,
Hərdən ağı deyib özümü ağlamağım gəlir!
Özüm özümü oda közə ata-ata yandırdım,
Qardaşımla, bacımla özüm özümü qandırdım.
Atama, anama dərd olmamaq üçün...
Dərdlərimi ürəyimdə dondurdum,
Bax, indi buz bağlamış ürəyim yandırır
məni!
Yandıqca donu açılan dərdlərim
Dondurur məni.
Hər kəsin laqeydliyinə heyrət eliyirəm.
Kimsə məni dinləməz,
özüm-özümə qeybət eliyirəm.
Qeybət haramdı, – deyib, – yenə
kiriyirəm.
Susmaq qızılmış – demə yalanmış!
Susmağın üzündən bütün ömrüm
talanmış.
Hər şeyi ürəyimə salıb dərd
etməkdənsə
Vaxtında demək daha asanmış!

## “KASIBLAR”

Hər şeyi pulla ölçənlər!
– Hər şeyiniz var,
Villalarınız...
Pullu qohumlarınız,
Hallı dostlarınız,
Vəzifəli dayınız,
Hər yerdən axıb gələn payınız...
Amma yenə də “kasıbsınız” siz!
Burda məhəllədə bir dükan açılıb
Orda bilirsən var nələr... nələr....
Səmimiyyət, qeyrət, bir də hünər.
Amma onu almağa
Sizin nə pulunuz çatar,
                nə də gücünüz,
Çünki: Siz kasıbsınız!

## POEMA

## BELƏ QOCALMIŞAM

Yaxşılıq bir Allah vergisi
Pislik gördüyünə də
Yaxşılıq qaytarırsan.
Pislik edənə
Yaxşılıq etdiyinə
Bir az da utanırsan.
Həya gözləyirsən,
Abır qanırsan...
Pisliyə yaxşılıqla
Cavab verəndə
Özünü xoşbəxt sanırsan.
Bu sevinci yaşadığına görə
Allahına şükür edirsən.
Şükürlərlə yaxşılıq
Arasında qalmışam
Nə yaxşı ki,
belə qocalmışam.

***

Sakit, səssiz
Oturmuşuq yanaşı.
Tərpənsən toxunaram
Gör nə qədər yaxınam sənə.
Tərpənməyə qorxuram,
Birdən toxunaram sənə.
Gör nə qədər uzağam sənə...
Yaxın və uzaqlığın

Arasında qalmışam –
Ömrümü sənə verib
Gör necə də qocalmışam.

***

Gəl oturaq yanaşı
Açaq ömür kitabımızı.
Vərəqləyək aram-aram,
Həm sənə yaxın...
həm uzağam.
Qalmışam ikisinin
arasında.
İnsan necə də qocalarmış
Yaxınlığın, uzaqlığın arasında?!

***

Oturmuşuq yanaşı,
Ürəyim döyünür
Asta-asta, aram-aram...
Xəyallara dalıram,
Xəyallarım quyu
dibində.
Gücüm çatmır qaldıram
özüm ilə aparam...
Yəqin qocalmışam;
Yaxın və uzaqlığın
Arasında qalmışam.

***

Övladı olunca
İnsanın gözündə
Hər şey hədərmiş.
İnsan hər şeyini
Övladına qurban edərmiş!
Övlad insanın
Bu günü, sabahı.
Övlad insanın
Gələcəyiymiş!
Övlad insanın başucalığı,
Övlad insanın
Barı, bəhəriymiş,
Şükür sənə Allahım!
Barlı, bərəkətli bağa varmışam.
Xatirələrlə xoş gələcəyin
Arasında qalmışam –
Nə yaxşı ki belə qocalmışam.

***

Övladlarım...
Barım, bərəkətim, bəhərim mənim...
Xatirələrim yunum,
Darağım, cəhrəm mənim.
Cəhrəm hərləndikcə
Xatirələr yumağa dönəcək.
Yada nələr, nələr gələcək...
Yayın cırhacırında
Kölgəli ağac altında
Od qalayıb samavar
Salardım.

Payız qabağı iməci çağırıb
Xəmir tutardım.
Əriştə kəsib, qışa yığardım...
Yaylaqdan gələn
Yağı, motalı, balı, qaymağı
Ləzzətlə yeyərdi hamı;
İndi də damağımda
Qalıbdı tamı.
Yarma, bulğur döyüb
Aşa saxlardım...
Qurut qoyub, qışa saxlardım.
Toyuq basdırardım.
Cücə saxlardım.
Heyif, gözəl günlərimdən
Dönüb şəhərli olmuşam.
Şəhərlə kənd arasında
qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Metro stansiyası,
Sonuncu dayanacağım,
Küncdəki boş yer...
Mənim yerim, otururam...
Oturan kimi gözlərimi yumuram.
Xəyallara dalıram...
Xəyalla gerçəklik
Dənizinə cumuram.
Ölçürəm, biçirəm,
Yaxşını yamandan seçirəm.
Bir yaxşının xatirinə

Yüz yamandan keçirəm
Of...
Yenə həmin nöqtə...
Yaxşılıqla yamanlığın
Arasında qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Qəhər boğazımı yandırır,
Göz yaşlarım içimə axır.
Gözlərim gəldiyim
Ömür yoluna baxır...
Allahım! Mən niyə bu qədər
Əfəl olmuşam?
Özümə əfəl deməyə
Dilim gəlmir.
Mən hər şeyi Allah
Rizası üçün etmişəm.
Öz haqqımdan
İnsanlıq xatirinə keçmişəm.
İnsanlığa dəyər verən varmı bəs?
Məgər mən yaşadıqlarımı
Dəyər üçün etmişəm?
– Yox...
İnsanlığın ölçü vahidi
Adamlarda pul imiş.
Pulun qarşısında adamlar
“kölə” imiş, “qul” imiş!
İnsanlığın ölçü vahidi
Şan-şöhrət, təm-təraq imiş.
Gözəl əxlaq, təmiz namus

Laf imiş....
Mən ancaq bununçün yaşardım.
Deməyə daha tapılmasa da sözüm
Allahım! Yanında ağdı üzüm.

***

Mən nikbin insanam,
Görünür nikbinliyim
Bu çətinliyi
Aşa bilibdir.
Mən sabaha
Ümidlə baxan insanam.
Görünür ümidim
Göz yaşımı boğa bilibdir.
Mən özümü
Bisutunu yaran
Fərhad sanmışam;
Hər şeyi kənara qoyub
Ailəmi qorumaq üçün
Vuruşmuşam.
Bu yolda
Nələrdən, nələrdən keçmişəm...
Beləcə qocalmışam.

***

Hər xırda şeydən
Sevinən uşaq kimiyəm;
Hamıya xoş olsun deyə
Səmtini dəyişən
Külək kimiyəm;
Hər münasibəti
Süzgəcdən keçirən
Ələk kimiyəm;
Heyif ömrümə
Ələndi getdi!
Arzularımın xəyalına
Bələndi getdi.
Çağırsam xəyallarım
Geri gələrmi?
Bu ələkdə
Xəyallarım da ələnərmi?
Arzularla xəyalların
Arasında qalmışam –
Beləcə qocalmışam.

***

Biz niyə başqaları kimi
Dərdləşə bilmirik?
Dərdlərimizi bir-birimizlə
Bölüşə bilmirik?
Hamının hayına çatırıq,
Öz dərdimizə qala bilmirik?!
Özgəyə əriştə kəsirik,
Özünüzə umac ova bilmirik?!
Niyə beləyik, niyə belə?
Bilmirik...

Niyələrə cavab
Tapa bilmirik.
Cavabsız sualların
Arasında qalmışıq –
Beləcə qocalmışıq.

***

Yol gedirəm...
Ömür yolu deyilən
Bir yol.
Aşağı baxıram
Dibigörünməz uçurum;
Yuxarı baxıram,
Quşqonmaz zirvə.
Qanadlanıb zirvəyə
Qalxmaq istədim;
Zirvədən ömür yoluma
Baxmaq istədim;
Bu arzudan o arzuya
Qoşdum...
Amma yenə də
Dibigörünməz boşluqdan
Qorxdum...
Niyələrlə dolu suallara
Cavab aradım.
Yaman qocaldım...
Mən ömrünü
Bu təzadlar arasında
Yaşadım.
Onunçün belə tez
Qocaldım.

***

Gecə yarı...
Uzandım yatmağa –
Yata bilmədim.
Acılı, şirinli xatirələri
İstədim başımdan atam,
Ata bilmədim.
Əlimə qələm aldım,
Keçmişləri yada saldım –
Göz yaşlarım içimə axdı.
Keçmişim həsrətlə
Mənə baxdı.
Gələn günlərimi borc verib
Keçmişimi almaq istədim.
Bircə anlıq keçmişimdə
Qalmaq istədim.
Keçmişim mənim gəncliyim,
Qocalığım gələcəyimmiş!
Keçmişim atalı, analı günüm,
Yetimliyim gələcəyimmiş!

***

Uşaq kimi ağladım
Mən anamı istədim,
Mən atamı istədim.
Onları mənə verin
Məni sürgünə göndərin
Onların qucağında
Uyuyum şirin-şirin.
Başımnan getsin
Dərdim-sərim.

Nolar, atamı mənə verin!
Nolar, anamı mənə verin!
Yoxsa ağlaya-ağlaya
Dünyanı selə verərəm!
Bircə günümü geri qaytarın,
Bütün ömrümü yelə verərəm.

***

Niyə yata bilmirəm?
Xəyalları başımnan
Niyə ata bilmirəm?
Ha qaçıram, qaçıram...
Keçmişimə çata bilmirəm.
Keçmişim yeddi dağın dalında
Yeddi dağın açarı
Yeddi divin əlində.
Gələcəyim qocalıb qalıb
Yeddi yolayrıcında.
Keçmişimdən qopa bilmirəm.
Gəlib qocalığıma
Çata bilmirəm...

***

Daha sənə sözüm yoxdu...
İçim dolu,
Amma çözüm yoxdu.
Var!
Dərya kimi hayqıraram,
Dalğa kimi köpürərəm,
Vulkan olub püsgürərəm...
Amma vulkan kimi

Ətrafımı yandırmaqdan
Qorxuram...
Bilmirəm...
Bəlkə yandırmaram!
Bəlkələrin arasında
Qalmışam.
Onunçün belə tez
qocalmışam!

***

Mənim taleyimə
Yazılan yazı
Soldu ömrümün
Neçə baharı, yazı.
Payızından, qışından
Səadətmi görəcəm?
Mən bu yazını niyə poza bilmədim?
Taleyimi yenidən
Niyə yaza bilmədim?!
O qüdrət məndə
Olsaydı əgər,
Taleyimi yenidən
Yaza bilsəydim əgər
Necə yazardım?!
Heç özüm də bilmirəm.
Bu yazılan yazıya
Başqa çözüm də
Bilmirəm.
Səadət – taleyə
Dözmək imiş;
Səadət – sevinci, kədəri

Bölmək imiş;
Səadət – yazılan
Taleyə şükür etməyi
Bilmək imiş!

***

Ağlayanda başımı köksünə
Qoyacaq bir insan istədim;
Sevinəndə sevincimi böləcək
bir insan istədim...
Ömrümün qüruba enən vaxtında
Nə qəmimə ortaq olacaq,
Nə sevincimi böləcək
Kimsəyi bula bilmədim!
Varlıqla yoxluq arasında
Axtarışda qalmışam –
Onunçün belə tez
qocalımışam...

***

Tənələrdən büzüşdüm,
Gileylərdən üşüdüm.
Sevgi dolu bir
Dünyam vardı,
Onu sizə saxladım.
Sizi sevgi ilə qucaqladım.
Siz mənim həyatım,
Dövlətim, varım.
Siz çətinliklə becərdiyim
Barım, bəhərim.
Sevgi sizə tac olsun,

Sevgisizlər sizə
Möhtac olsun.
Sevginizi sevgi ilə paylayın,
Dünyanı, bir-birinizi
Sevgi ilə qucaqlayın.

***

Lazım olanda
Niyə yanımda yoxsan?
Sevincimə ortaqsan,
Qəmimdə niyə yoxsan?
Bir gün varsan, bir gün yoxsan.
Varlığınla yoxluğunun
Arasında qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Mən boş-bekar oturan
Adam deyiləm.
Mən həmişə
İşdə-gücdə olmuşam.
Kiminsə harayına çatıb
Kiməsə lazım olmuşam.
İndisə lazımsız bir şey kimi
Hər kəsdən, hər şeydən
Kənar qalmışam.
Onunçün kövrəlmişəm,
Onunçün də dolmuşam;
Lazımsız olmaq istəmirəm!
Kənarda qalmaq
İstəmirəm...

***

Dərdimi dəvə çəkə bilsə
Sarvanı sən ol istərəm.
Tale yenidən yazılsa,
Mənimki yenə də
Sən ol istərəm...
Ömürdən seçim olsa,
Mən gedim,
Sən qal istərəm.
Səni yanımda yox sanmışam,
Mənlə mənsizlik arasında
Qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Telefona baxıram
Dərdləşməyə cana yaxın
Adam axtarıram.
Kimsə yoxdu...
Niyə axı?
Oğlanlarım, gəlinlərim
Nəvələrim, qardaş-bacılarım,
Bəs mən niyə yalnız qalmışam?!
Sanki yalnızlıq dənizində
Boğulmuşam...
Sahillə dəniz arasında
qalmışam –
Onunşün belə tez
qocalmışam.

***

Mən telefona baxıram
Telefon mənə,
Zəng eliyəcək adam da yoxdu.
Hamı işində-gücündə...
Bircə mənəm dərdlərimlə
Baş-başa qalan,
Bircə mənəm keçmişimlə
Savaşan;
Keçmişi xatırladıqca
Kövrələrək özüm özümlə danışan.
Nə qədər danışmaq olar?
Haqlıykən haqsızlığa
Yanıb tökülmək olar?
Yana-yana kül oluram
Külümü görən yoxdu;
Ağladıqca göz yaşım sel olur.
Boğulduğumu görən yoxdu.
Yoxluqla varlığın arasında
qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Yatmaq istəyirdim
Amma yata bilmədim.
İsti yatağımdan durmuşam,
Dərmanlarımı içib oturmuşam.
Ev səssiz, kimsəsiz...
Kimsəsizlikdən yorulmuşam
Gözüm qapıda, qulağım səsdə,
Nəvələr gəlməsə yaşaya
bilmərəm yəqin.
Biri öskürəndə ürəyim əsir,
Ürəyim bölünüb nəvələrimin
arasında.
Qorxuram, birdən tez ölərəm...
Nəvələrimin böyüdüyünü
görmərəm.
Birinin gəlin gətirdiyini,
Birinin gəlin köçdüyünü
Xəyallarımda görürəm.
Ümidlə yaşayıram!
Gerçəklə xəyallar arasında
qalmışam –
Onunçün belə tez qocalmışam.

***

Şüşədən kövrəyəm mən,
Diqqətsiz olsan çiliklənərəm.

***

Qəlbimə həmdəm aradım,
Bulmadım;
Dərdimə dərman aradım,
Bulmadım;
Dəvasız dərdimə loğman aradım,
Bulmadım;
Gör nə qədər kor oldum ki,
Aradığımın qəlbimdə
Olduğunu bilmədim!

***

Kəhkəşana əl uzatdım
Ayı, ulduzu qəlbimə yığdım.
İşığı sənin olsun!
Günəşə qucaq açdım,
İçim nurla doldu
İstisi sənin olsun!
Külək tellərimi daradı,
Sığalı sənin olsun!
Torpaq ayaqlarımı oxşadı,
Çəməni sənin olsun!
Bütün qayğılar mənim
Sevinc dolu dünyam
Sənin olsun!

***

Hərdən köksümü ağır-ağır ötürürəm,
Hislərimi vərəqlərə köçürürəm.
Keçmişimi göz önünə gətirib,
Özümü xəyallarda itirirəm.

***

Bilmirəm...
Nədənsə xəyallara daldım.
Xəyal dünyasında
Keçmişimə qayıtdım.
Nələr.... nələr...
Yaddaşımda sıralandılar
İnsan hər xırda şeyin də
Həsrətini çəkərmiş.
Xəyal aləmindən qopanda
Hiss etdim ki,
Boğazım göynüyür.
Gözüm keçmişimin həsrətini
Çəkdiyi üçün
Göz yaşlarım içimə axmış.
Sən demə gəncliyimlə
Qocalığımın arasında qalmışam –
Onunçün belə tez qocalmışam.

***

İlahi!
Eşqin qəlbimdə
Eşqinə kölə oldum, kölə,
Eşqin məni özünə məcnun etdi.
Adım düşdü dildən-dilə.

***

Niyə səni istədi ürəyim?
Heç özüm də bilmirəm.
Nədən oldun gərəyim?
Heç özüm də bilmirəm.

***

Dərddən-qəmdən
Qopmaq istədim,
Xoş xatirələrin
qoynunda
Yatmaq istədim...
Gözlərimi yumuram...
Çən, duman görürəm,
Çən duman içində
İşıqları sayrışan
Uzaq-uzaq evlər
görürəm;
qaçıram, yüyürürəm,
Bu küçədən o küçəyə
Dönürəm.
Tinləri buruluram
Yoruluram...
Evimizi tapa bilmirəm
Yoxsa mən azmışam?
Yox...
Atam, anam ölmüş,
Evimiz də yetim qalmış...
Solmuş, saralmış
Acılı şirinli
Xatirələrə dalmış...
Kövrələ-kövrələ
Yuxudan ayrılıram.

***

Gözlərində bir yaz gördüm
Güllər açılmışdı;
Gözlərində bir yaz gördüm.
Bülbüllər oxuyurdu;
Güllər üstündə
Gözlərində bir yaz gördüm;
Ürəyim titrədi bir asta mehdən
Gözlərində bir yaz gördüm;
Bülbüllər içirdi güllərdəki şehdən...
Gözlərində bir yaz gördüm;
Qorxdum əsən mehdən...
Birdən yuxudan oyadar məni.
Qorxdum ayağımı isladan şehdən
Birdən xəyallar dünyamdan
Qoparar məni.

***

Zəng vururam...
Telefon çalır, çalır, çalır...
Amma cavab verən yoxdu.
Birdən elə bil yuxudan
Oyanıram.
Kim cavab verəcək ki?
Axı sən köçmüsən.
Ürəyimə dünya qədər
Dərd yükləmisən!
Keçən günləri bir-bir
Yada salıram,
Dərdinlə baş-başa qalıram.
Göz yaşlarım selə dönür –

Bu seldə boğuluram.
Qəhər boğazımı yandırır
Ancaq səni, bircə səni
Köməyə çağırıram,
Harayıma səs vermirsən
Niyə köməyimə gəlmirsən?!

## ATALAR DEYİBLƏR, BİZ DƏ DEMİŞİK...

İt hürər, karvan keçər,
Yel qayadan nə aparar? – deyib keçmə.

Yel qayanı yalaya-yalaya muma döndərər. Sonra da yolundan qaldırıb cəhənnəmə göndərər.

Necə ki qaçqın, didərgin deyib göndərdilər. Cənnətimizi cəhənnəmə döndərdilər.

Gözlərimdə qəm ağlar,
Yaş qurtarar, nəm ağlar.
Barın yağıya qaldı,
Viran olun, a bağlar.

## XATİRƏLƏRİN İŞIĞINDA

### MARAL

Atam əlində bir dəstə qəzet içəri girdi. O, həmişə bu vaxt evə günorta yeməyinə gələrdi. İndi də plaşını soyunub divardan asdı. Stul çəkib əyləşdi. Bir qolu ilə stola dirsəklənib əlindəki qəzeti açdı. Atama süfrə açan anam soruşdu:

– Nolub sənə, a kişi?

Atam cavab vermədi.

Anam bir də təkidlə soruşdu:

– Niyə elə eliyirsən? A kişi nolub?

Atam kədərli bir səslə cavab verdi:

– Göhər, Göhər, bilirsən nolub? Maral ölüb.

Anam diksindi:

– Kim dedi, nə vaxt?

– Bu qəzetdə qardaşı Taryelə başsağlığı veriblər.

Anam sakitcə stola çökdü. Atam nekroloqu oxudu və susdu. Atamın sifətindən ağır bir kədər oxunurdu. Sanki ürəyindən gələn sözlər gözündə yaşa dönüb yanağına süzülmək istəyirdi. Anam atamın yanına keçdi. Saçlarını tumarladı, sakitcə başının ortasındakı keçəl yerdən öpdü, gözünün yaşı atamın saçlarını islatdı. İkisi də sakitcə ağlayırdı. Mən maraqla gözləyirdim. Bu dəfə anamın bayatısı məni də ağlatdı:

Qərib öldü, götürün,
Dar küçədən ötürün.
Qəribin öldüyünü,
Sevdiyinə yetirin.

Layla həsrət Maralım, layla,
Dərdini mən alım, layla.

Anamın bir-birinin dalınca dediyi bayatılar atamı lap kövrəltmişdi. Onsuz da yumşaq ürəkli olan atam doyunca ağladıqdan sonra sakitləşdi. Sonra əl-üzünü yuyub, bir az dincəldi. İşə qayıdanda anam ona dedi:

– A kişi, sən də Taryelə başsağlığı göndər.

Atam – yaxşı – deyib getdi.

Mən anamdan soruşdum:

– Mama, Maral kimdi?

Anam dedi:

– Maralın atası Yaqub Qəribov bizim rayonda ispolkomun sədri işləyirdi. Maral çox gözəl və ağıllı qız idi. Atan da burda ən gözəl və boylu, buxunlu oxumuş oğlan idi. Onu çox sevən vardı. Amma atanın ürəyi Maralda, Maralın da ürəyi onda idi. Amma neyniyəsən, dünyadı da, atalığı Maralı Güləhmədə almağa razı olmadı.

– A bala, yetim oğlansan, qıvrıl yat yerində, raykomnan quda olmaq hara, biz hara?

Bundan sonra yazıq atan Marala olan sevgisini ürəyində dəfn etdi. İndi başa düşürəm ki, yazıq atan yetim olmasaydı, öz atası olsaydı oğlunu sevdiyinə qovuşdurmaq üçün əlindən gələni eliyərdi.

Anamın bu sözləri məni çox kövrəltdi, atamın nakam məhəbbətinə doyunca ağladım. Bir neçə il əvvəl atamla şəhərə bazarlığa getdiyim gün yadıma düşdü. Soyuq hər payız günü idi. Rayon mərkəzindən şəhərə – Gümrüyə bir saatda bir avtobus gedirdi. Atamla birlikdə bazar-dükanı gəzib hamımız üçün payız ayaqqabısı və paltarlar aldıq. Şəhərə gələndə atam həmişə məni gürcü xəngəli yeməyə

aparardı. Bu dəfə də unutmadı. Biz xəngəl yeyib yeməkxanadan çıxdıq. Bəlkə bundandır ki, mən indi də gürcü xəngəlini sevirəm. Yeməkxanadan çıxmağımızla yağışa düşməyimiz bir oldu. Özümüzü avtobusa çatdırdıq. Avtobus tərpənəndə atamın gözü ikinci sırada, pəncərənin yanında əyləşən cavan kişiyə sataşdı. Bir az diqqətlə baxandan sonra yerindən durub ona tərəf getdi. Görüşmək üçün əlini irəli uzadaraq:

– Siz Taryelsiniz, eləmi – deyərək soruşdu:

– Bəli, Taryeləm – deyən gənc adam əlini irəli uzadıb atamla görüşdü. Atam özünün müəllim olduğunu, maarif şöbəsində təhsil üzrə inspektor işlədiyini söylədi. Mən yerimi Taryellə dəyişdim. O, atamla yanaşı oturdu. Rayona çatana kimi söhbət etdilər. Taryel atasının və anasının pensiya sənədlərini düzəldib aparmaq üçün Amasiya gəldiyini söylədi. Mən onların söhbətindən başa düşdüm ki, Taryelgil o hələ uşaq olanda köçüb Azərbaycana gediblər. Atam onu bacısına bənzədərək tanımışdı. Avtobus rayona çatanda yağış nisbətən azalmışdı. Taryel qonaq evində qalacağını söylədi. Atam qəti etiraz etdi. Onu evimizə dəvət etdi. Anama qonağın Yaqub Qəribovun oğlu olduğunu söylədikdə anam həm çox sevindi, həm də kövrəldi. İki gün bizdə qaldı. Anam əlindən gələn qədər ona qulluq elədi. O qayıdandan sonra atam yığdığı lazım olan sənədləri poçtla ona göndərdi. Mən onda bildim ki, Taryel Maralın qardaşı imiş. Anam gənclik illərini yada salaraq kövrəlibmiş.

# ATAM HAQQINDA BİR NEÇƏ SÖZ

Atamın haqqında yazmaq istəyirəm, amma yaza bilmirəm. Nə vaxt ki onun haqqında düşünürəm, başlayıram ağlamağa, niyə, bilmirəm. Bircə onu bilirəm ki, mənim atam içi sevgi dolu, məhəbbəti hamıya çatan, xeyirxah, səmimi və mehriban birisi idi. Onu tanıyanlardan kimsə deyə bilməz ki, kiminsə qəlbinə dəyib, kimə qarşısa kobud olub, heç vaxt. Atam çox həssas adam idi. Birinci kəlməndən nə demək istədiyini anlardı. Atam qocalığında da gəncliyindəki kimi gözəl idi. Hündürboylu, enlikürəkli, genişalınlı, üz-gözündən nur tökülürdü. Bütün ömrünü Ağbabada təhsilə, məktəbə həsr etmişdi. Hər il sentyabrın birində o, bayram sevinci yaşayardı. Başdan ayağa təzə və şıx geyinərdi. Bəlkə ondan mənə də bu bayram sevinci keçib. Mən də həmişə üç ay tətildə dərs ilinin başlanmasını bayram həvəsi ilə gözləyərdim. Biz demək olar ki, qohum-əqrəba bir məhəllədə yaşayırdıq. Atam işdən evə gələndə həyətdə oynayan uşaqları bir-bir başının üstünə qaldırar öpər, əzizlər, sonra yerə qoyardı. Qonşu və qohum uşaqlar buna vərdiş etmişdilər. Atamı görən kimi qabağına qaçardılar. Atam "Azərbaycan" jurnalı və "Ədəbiyyat və incəsənət" qəzetinin həmişəlik abunəçisiydi. Ona görə də biz hələ kitab halında çap olunmayan əsərləri vaxtından qabaq bu jurnal və qəzetdən oxuyardıq. Bəzən uzun qış gecələrində maraqlı bir əsəri atam hündürdən oxuyar, anam yırtıq-sökük tikə-tikə ona qulaq asardı. Atamın çox gözəl bədii qiraət qabiliyyəti vardı. Hə, bədii qiraət dedim, yadıma düşdü. Atam gənclik illərində rayon mədəniyyət evində dram dərnəyi yaratmışdı. Məktəbdən yuxarı sinif şagirdlərini və qabiliyyətli gəncləri o dərnəyə cəlb etmişdi.

Ən çox oynadıqları əsərlər Cəfər Cabbarlının əsərləri idi. Mən o vaxt ikinci, ya üçüncü sinfə gedirdim. Bir dəfə "Solğun çiçəklər"i tamaşaya qoymuşdular. Salon ağzına qədər dolu idi. Atam Bəhram rolunu oynayırdı. Mən qabaq sıralarda oturmuşdum. Tamaşa mənə çox təsir eləmişdi. Mən tamaşaya baxa-baxa ağlayırdım. Tamaşa qurtaranda yenə də ağlayırdım. Hamı o qədər təbii və canlı oynayırdı ki, inanmazdın bu həvəskar bir dərnəyin işidi.

Evimizdə zəngin kitabxanamız vardı. Dünya klassiklərinin əsərlərindən tutmuş müasir yazıçılar və şairlərin əsərlərinə qədər bizdə vardı. O vaxt ədəbiyyat müntəxəbatı deyilən dərslik tapılmırdı. Atam məktəbdə tədris olunan bütün bədii ədəbiyyatı toplamışdı. Demək olar ki, bizim ev məhəllədə və məktəbdə kitabxananın yerini tutmuşdu. Anam bəzən atama zarafatla M.Ə.Sabirin şeiri ilə deyərdi:

– Pulların bütün dönüb oldu kitab.

Atamın gözəl səsi vardı. Xalq mahnısı "Qaragilə", "Kəklik" və başqalarını elə gözəl oxuyardı ki, elə bilərdin xanəndəyə qulaq asırsan. Folkloru atam da, anam da gözəl bilirdi. Qışın uzun gecələrində söhbət gəlib o yerə çatardı ki, bir də baxardın anamla atam nanay deyir. Həvəslə onlara qulaq asar, arada biz də onlara qoşulardıq. İndi də qardaş və bacılarım bu nanayları gözəl bilirlər. Kəndə aşıq gəlib xəbəri yayılardı. Aşıqlar dayımgildə qonaqlanar, məclis də onlarda qurulardı. Torpaq döşəməli, böyük otaqları vardı. Altdan həsir döşüyər, üstdən xalça, palaz sərərdilər. Atam anamı aşıqlara qulaq asmağa getməyə qoymazdı. Bəhanəsi isə xəstə nənəm olardı. Biz isə axşam düşən kimi aşıqlara qulaq asmaq üçün dayımgilə qaçardıq. Mən lap ön cərgədə otururdum. Axşam ev işlərini qurtaran camaat bura

yığışardı. Aşıqlar bir-biri ilə deyişər, bir dastanı bəzən üç günə söyləyərdilər. Bəlkə uşaqlıqdan qanıma işləyib sazın səsi. İndi də mizrab simə toxunanda elə bilirəm ürəyim titrəyir. Nə isə axşam gecənin bir yarısı evə qayıdardıq. Anam kimlərin ora gəldiyini bizdən soruşardı. Anam gözəl qadın idi, həm də çox gözəl. İndi başa düşürəm ki, atam anamı aşıqlar görsə söz qoşar, – deyə qısqandığı üçün ora getməyə qoymurdu.

Evimizin dalında Milaz əmigilin evləri idi. Onun arvadı Bahara bütün məhəllə uşaqları "Aba" deyərdi. Abamgilin böyük tövləsi vardı. Kənddə toy olanda gecəni həmin tövlədə çalardılar. Tövlə deyəndə böyük toyxana kimi bir yer idi. Ora heyvan salmazdılar. Nə isə... Axşam camaat ora yığışar, çalğıçılar gecənin yarısına qədər çalardılar. Zurnanın, nağaranın səsi gecənin səssizliyində kəndi başına götürərdi. Anam çox vaxt işdən-gücdən macal tapıb toy damına gedə bilməzdi. Toy damında uşaqlar yerə sərilmiş samanın üstündə qabaq sırada oturardılar. Mən də kiçik bacılarımı özümlə aparardım. Balaca bacımdan anam soruşardı:

– Bahar, Yasəmən oynadımı?

Bacım həvəslə onları yamsılayar, düz onlar kimi oynayar, biz də gülməkdən birtəhər olardıq.

Toyların birində Cəvahir yengəmlə (dayımın arvadı idi) Laləzar xala "Koroğlu" rəqsini oynadılar. O rəqsi hər adam oynaya bilməzdi. Amma onlar bu rəqsin ən mahir ifaçıları idi. Bir sözlə, hər kəsin öz qaydası var idi. Nə isə... Cəvahir yengəm üzünü zurnaçılara tutub dedi:

– Eh, heç də yaxşı çalmadınız, heç sümüyümə düşmədi.

Çalğıçılardan biri dedi:

– Rəhmətliyin qızı, az qala iki saatdı nəfəsimiz kəsilə-kəsilə çalırıq, oynayırsan, hələ sümüyünə düşməyib?

Adamlar bu sözlərə xeyli gülüşdülər.

Toylarda neçə cür yallı, "Çeçələ barmaq" oynanılardı.

Atam Amasiya Rayon Xalq Maarif Şöbəsində müfəttiş, orta məktəbdə müəllim, yataqxanada isə tərbiyəçi müəllim idi. Ağbabada səkkizillik məktəbi qurtaran uşaqlar orta təhsil almaq üçün rayon mərkəzindəki məktəbə gələrdilər. Bəziləri qohum evində qalar, digərləri isə yataqxanada qalardılar. Orta məktəbin müəllimləri həmin yataqxanada növbətçilik eliyər, uşaqların təhsilinə, tərbiyəsinə və ehtiyaclarına nəzarət eliyərdilər. Bir dəfə atamın növbəsi zamanı Əli adlı oğlanın saatı itir. Atama şikayətlənən Əlidən atam soruşur:

– Saatın necəydi?

O, cavabında deyir:

– "Mənim saatım "Marskoy"du,

Altı gümüş, üstü pryamoydu"

Onun bu cavabı şeirə dönərək çoxlarının xatirəsində indi də yaşayır (Atam həvəslə onun cavabını şeirə çevirmişdi). Atamın şagirdləri onu çox sevir, xatirini əziz tuturdular.

Təhsilə çox yüksək qiymət verən atam hamımızın ali təhsil almamızı istəyirdi. Onun üçün ən qiymətli xəzinə elm, insanın dünyagörüşü və səviyyəsi idi. O vaxt "qatavalnik" deyilən, həndəsə və riyaziyyatda istifadə edilən pərgar dəsti tapılmırdı. Atam məktub yazaraq poçt vasitəsi ilə Moskvadan gətirmişdi. Loqarifma xətkeşindən və pərgar dəstindən sıra ilə bütün qardaş-bacılarımız istifadə etdik. Anam onlara çox muğayət olurdu.

Kənddə kimin işi müşkülə düşdüsə atam mütləq ona kömək eliyərdi. Hansısa idarəyə ərizə yazan, müraciət edən hər kəsə haqlarını tələb etməyi başa salardı. Sonradan bu xasiyyətinə görə mən onu Mirzə Səfərə bənzədərdim. Çünki atam heç kəsə yersiz söz deməz və artıq sözü də heç vaxt götürməzdi. Mən onu bilirdim ki, atam çox düz adam idi. Düzə zaval yoxdu deyərdi. Düz qılıncı kəsər. Mənim atamın sözü yeri gələndə qılıncdan iti olardı.

O, bizə əl qaldırmaz, danlamazdı. Tərs-tərs baxanda biz işimizi bilərdik.

Atam çox qohumcanlı idi. Onun əmisi, dayısı yox idi. Xalaları vardı. Xalalarını, onların uşaqlarını çox sevirdi. Onlar atama “dayı” deyir, hörmətini çox saxlayardılar. Atamın üç bacısı, iki qardaşı vardı. Atam onları çox sevirdi. Onların balalarını bizdən ayırmazdı. Bəzən bizə qışqırsa da, onların xatirinə heç vaxt dəyməzdi. Mən deyərdim ki, onların uğurlu işlərinə bəlkə də öz ata-analarından çox atam sevinərdi. Bakıya köçdükdən sonra atam mənimlə 167 saylı məktəbdə işlədi. Atam rəhmətə gedəndə mənim iş yerimdən bütün müəllimlər gəlmişdi. Onlardan bəziləri atamı “qoca” hesab etdikləri üçün bizim onu “layla”– deyib ağlamağımız onları təəccübləndirmişdi. Atamın xalasının ağzı Quranlı, kişi xarakterli gəlini – Zərqələm yengə onlara dedi:

– Siz düşünürsünüz ki, bu kişi yaşlıdı, xəstədi, hər gələn köçəcək, biz niyə belə ağlayırıq? Biz bu kişini yaşına görə yox, insanlığına, hamımıza qarşı qayğıkeşliyinə və sevgisinə görə ağlayırıq. Qaçaqaçda biz canımızı götürüb qaçdıq. Amma bu kişi rayon mərkəzindəki bəzi idarələrdən çoxumuza aid olan sənədləri də özü ilə gətirmişdi. Sonra da qaçqın düşən tanıdıqlarını axtarıb onlara aid sənədləri

özlərinə verdi. Mən yox, siz deyin. Kim bu işi düşünər, görərdi? Bu hələ onun kiçik bir işidi. Bəs biz ağlamayaq, kim ağlasın. O, yetimə havadar bir kişi idi.

Yetim dedim, yadıma düşdü. Atam Bakıya təzə gələndə Mərdəkandakı uşaq evində işə düzəlmişdi. Mən deyərdim ki, atamın orda işlədiyi bir ildə ömründən on il getdi. Hər gün bir dəstə qələm alar, evdən cibinə konfet qoyar, o uşaqlara aparardı. Uşaqların dediklərini gəlib evdə danışanda ağlayardı. Uşaqlardan bəzilərinin ya atası, ya anası olduğunu deyərdi. Bu uşaqların pəncərə qabağında saatlarla ata, ya ana gözlədiklərini deyəndə biz də ağlayardıq. Atam beş, ya altı yaşında olanda atasını itirmişdi. Ata həsrəti onun ürəyində ömürlük bir nisgil idi.

## SİNİF MÜƏLLİMİM

Müharibədən sonrakı illər də ağır keçdi. Bu illərin ağırlığını, əzabını o illərdə yaşayanlar yaxşı bilirlər. Sözüm onda deyil, 1947-ci ildi. Yadımdadır, müharibəyə gedənlərin çoxunun qara kağızı gəlmişdi, qayıdanlar da yaralı, əli-qolu, ayağı şikəst adamlardı, üstəlik, itkin düşənlər də az deyildi. Dava neçə qapını bağlı, neçə ürəyi dağlı, neçə uşağı yetim qoymuşdu – bunun burasını bir Allah bilirdi. Daha müharibə qurtarsa da onun qara yelləri əsməkdə davam edirdi. Aclıq və qıtlıq meydan sulamaqdaydı.

Mən birinci sinfə gedirdim. Baxdım burada 13-14 yaşında uşaqlar da var. Müəyyən səbəblər üzündən bu uşaqlar vaxtında məktəbə gələ bilmədiklərindən birinci

sinifdə oxumağa gəlmişdilər. Bizə boylu-buxunlu, yaraşıqlı bir gənc oğlan, yəni Güləhməd müəllim dərs deyirdi. Əslində onun sinfimizdəki yaşlı oğlanlardan yaş fərqi azdı, amma buna baxmayaraq, müəllim bu müxtəlif yaşlı uşaqlarla dil tapmışdı. Üstəlik, hər çətinliyə də bir çarə tapırdı. Sinifdə yazı yazmağa nə dəftər, nə də mürəkkəb vardı. Güləhməd müəllim mətbəədən kağız gətirib ondan bizə dəftər düzəltdi, sonra mürəkkəb tozu alıb mürəkkəb hazırladı. O, hazırladığı dəftəri və mürəkkəbi uşaqlara payladı. Bizdə elmə, təhsilə böyük maraq oyatdı. Mənim oxumağa marağım əzəldən vardı, Güləhməd müəllim bunu daha da qüvvətləndirdi. Amma imkansızlıq, ehtiyac yenə boz üzünü göstərməyə başladı, həm də həmin il payız bir az da soyuq keçirdi. Bəli, oktyabr nisbətən soyuq idi. Ayaqqabım olmadığına görə məktəbə gedə bilmədim. Bu hadisə məni çox incidirdi. Amma Güləhməd müəllim bunun da çarəsini tapmışdı. Çünki bizim evimizlə onun evi çox yaxındı. O, vaxtaşırı bizə gəlir, mənim evdə necə hazırlaşdığıma nəzarət edirdi. Yadımdadır, mən bir də aprel ayında, yəni qar əriyəndə məktəbə getdim. Sevindiyimdən quş kimi qanadlanıb uçmaq istəyirdim. Bəli, mən I sinfi əla qiymətlərlə başa vurdum.

Yadımdadır, Güləhməd müəllim bir də bizə IX sinifdə oxuyanda dərs dedi, həm də sinif rəhbərimiz oldu. O, bizimlə kitab müzakirəsi keçirməyi çox sevirdi. Müəllimimiz ədəbiyyatı və dili çox mükəmməl bildiyindən, üstəlik, geniş dünyagörüşlü olduğundan bizdə ədəbiyyata xüsusi məhəbbət və sevgi oyada bilmişdi. Buna görə də onunla gəzməyə, təbiətin qoynuna çıxmağa tələsirdik. Biz onun çəmənlikdə, göy otların üstündə oturub şirin

söhbətinə qulaq asar, sinədən əzbər dediyi şeirləri huşi-guşla dinləyərdik. Maraqlıdır ki, müəllim Mirzə İbrahimovun “Gələcək gün” romanından elə kövrək və qəmli səslə danışardı ki, elə bil həmin romanın qəhrəmanlarından biridir, sanki o mühitdən qopub gəlib. Biz onu dinlədikcə gözlərimiz yaşarardı. Məktəbdə biz Güləhməd müəllimi olduqca çox istəyirdik. Bu da boşuna deyildi. Çünki bu gülərüz, böyük ürəkli müəllim bizim hər birimizlə müəllim kimi deyil, tay-tuş kimi, dost kimi rəftar edirdi. O, yeri gələndə tələbəlik illərindən də söz açar, Səməd Vurğunu lap yaxından gördüyünü deyər, şairin vaxtsız ölümünün hər kəsi yandırdığını söyləyərdi. Biz onun səsinin titrədiyini, gözlərinin yaşardığını görərdik.

Güləhməd müəllimin yaxşı rejissorluq qabiliyyəti də vardı. Yadımdadır, mən 1956-cı ildə IX sinifdə oxuyurdum. Güləhməd müəllim “Alma ağacı” adlı bir pyesi tamaşaya hazırladı. O, həm rejissorluq edir, həm də rolların yaxşı ifa olunması üçün bizə faydalı məsləhətlər verirdi. Tamaşa çox yaxşı alındığından müəllimin məsləhəti ilə “O olmasın, bu olsun” əsərini də tamaşaya qoyduq. Bu da uğurlu alındı. Buna görə də biz Güləhməd müəllimin rəhbərliyi ilə “Solğun çiçəklər”i tamaşaya hazırladıq. Bəhram rolunu götürən oğlan xəstələndiyindən onun rolunu Güləhməd müəllim özü oynamalı oldu. Bu tamaşa çox yaddaqalan oldu.

Mən orta məktəbi medalla bitirdim. O vaxtlar orta məktəbi medalla bitirənlər ali məktəblərə imtahansız qəbul olunurdular. Maddi vəziyyətimiz ağır olduğuna görə mən həmin il sənədlərimi ali məktəbə verə bilmədim. Güləhməd müəllim də buna çox təəssüfləndi.

Yadımdadır, mən Tibb İnstitutuna qəbul olunanda Güləhməd müəllim necə sevindi, şad oldu. O, sevincindən bilmirdi neyləsin.

Bəli, Güləhməd müəllim müəllimlərimin içində ən istəkli və əziz, unudulmaz şəxsiyyətdir.

**Rauf ŞABANOV,**
*həkim-kardioloq*

## HƏYATIMDA TANIDIĞIM ƏN GÖZƏL İNSAN

Zahirən hamı kimi idi, Qasım müəllim. Amma mənəviyyatca onun kimi gözəl ikinci bir adam tanımıram desəm, daha doğru olar. Yetimin başına sığal çəkən, fağırın halına yanan, dostun xeyir işinə sevinən, tanışın toyunda əl qaldırıb oynayan bu adam mənim idealım idi. Mən onun kimi elinə, obasına bağlı, millət dərdi çəkən, hamıya əl tutan, hər kəsə yardım eliyən başqa birini tanımadım, görmədim. Onun Güllübulağa hər gəlişi toy-bayram idi. Hamıdan çox da uşaqlar sevinərdi. Uşaqların hamısına hədiyyə alar, onlara nəvaziş göstərərdi. Uşaqlar onun könlünü qazanmaq üçün sanki yarışa girərdilər. Kəndə gələn kimi heyvan kəsilər, süfrə açılar, hamı ona xoşgəldinə gələrdi. Qasım müəllim küsülüləri barışdırar, xəstələri ziyarət eləyər, el şənliklərində iştirak eləyər və bundan böyük zövq alardı. Qohum-əqrəba onu qonaq çağırar, əzizləyərdi. O, həyat yoldaşım Abbasın əmisi idi. Mən, 1975-ci ildə Güllübulaq kəndinə Yusif Mustafayevin ailəsinə gəlin gəlmişdim. Amasiya rayonunda sayılıb-seçilən bu ziyalı ailəsi ilə atamgilin dostluq əlaqələri

birləşdirirdi. Elə bu dostluğun sayəsində mən bu ocağa qismət olmuşdum. Yusif müəllim rayonun ən savadlı riyaziyyat müəllimi idi. Ataları repressiya qurbanı olmuşdu. Böyük qardaş kimi, Yusif müəllim kiçik qardaşı Qasım müəllimin hər cür qayğısını çəkmişdi. Təhsilə, savada, mədəniyyətə və dünyagörüşünə xüsusi qiymət verən Qasım müəllimə – Qasım Mustafayevə mən də əmi deyirdim. O, mənim həyatda çox sevib hörmət etdiyim adam idi. Qasım əmi təkcə riyaziyyatçı deyildi. O, dünya ədəbiyyatını çox sevir və oxuyurdu. Kənddə olduğu günlərdə bir də baxırdın ki, qaynatam Yusif əmi ilə gecə səhərə qədər Firdovsinin "Şahnamə"sini sıra ilə əzbər söyləyirlər. Bəzən dayanıb gerisini məndən soruşardılar. Mən əzbər bilmirdim. Qaldıqları yerin davamının məzmununu söyləyirdim. Mənə məzmununu düz söylədiyimə görə zarafatla gülər, yenə əzbərdən davam eliyərdilər. Mən onların bu istedadına heyrət eləyərdim. Füzulinin "Leyli və Məcnun"unu elə həvəslə söyləyərdilər ki, mən onların süfrəsinə çay gətirə-gətirə aşiqlərin faciəsinə kövrələrdim. Şeirə, saza, folklora çox bağlı idi. Bir dəfə Hamasada toyda iştirak edərkən gözəl səsi olan, aşıq havalarını özünəməxsus tərzdə ifa edən Alışan dayımdan xoşu gəldiyi üçün toydan sonra onu Güllübulağa gətirmişdi. Alışan dayı "Meşəbəyi"-ni elə həvəslə oxuyurdu ki... Onun aşıqsayağı oxunmasından Qasım əmi ləzzət alırdı.

Yadımdadı. 1979-cu ildə o, kəndə makinada yığılmış Mirzə Talıbovun "Səma elçisi" kitabının surətini göndərmişdi. O vaxt ilk dəfə idi ki, mən Məhəmməd Peyğəmbər haqqında əsər görürdüm. İslam tarixi haqqında ilk məlumatı mən o zaman oxudum. Mən bəzi əsərlərdən,

Nizamidən, Füzulidən dinimiz haqqında oxumuşdum. Buna baxmayaraq “Səma elçisi” kənddə əl-əl gəzdi.

Qasım əmi Azərbaycan Pedaqoji İnstitutunda işlədiyi müddətdə ehtiyacı olan, qapısını kömək üçün döyən hər kəsə təmənnasız yaxşılıq eləyirdi.

Naxçıvan Pedaqoji İnstitutunda prorektor işlədiyi vaxt oranın müəllimlərindən iki nəfəri Amasya rayonuna göndərmişdi. Hazırlıq kurslarında oxumaq üçün gəncləri cəlb etsinlər. Müəllimlər rayon mərkəzindəki fabrikdə işləyən azərbaycanlı qızlarla görüşüb kurs haqqında məlumat verdilər. Ondan sonra rayon mərkəzindəki tikiş fabrikindən 9-10 qız Naxçıvana oxumağa getdi. İndi onlar müxtəlif məktəblərdə müəllim kimi çalışırlar. Təmənnasız yaxşılıq budur. Qasım əmi belə ziyalı idi.

Deyirlər, yaxşılığa yaxşılıq hər kişinin işidi, yamanlığa yaxşılıq ər kişinin işidi. Qasım əmi yamanlığa da yaxşılıqla cavab verən fədakar ziyalı idi.

## QEYDLƏR VƏ İZAHLAR

1. Bir başqa variantda “sarı sancaq” işlənib
2. Bu vəsfi-halın digər bir variantı da məlumdur.

Su gəlir, lilləndirir,
Baxçanı gülləndirir.
Dərdliyə söz deməyin,
Dərd özü dilləndirir.

3. Başqa bir variant belədir:

Əllək ələk asdılar,
Ələyə gül basdılar.
Yaxşı qızın kəbinin
Pis oğlana kəsdilər.

Bu vəsfi-hal deyişmə nanayı “Ay Nabat xanım”da da vardır.

4. Qarğış şəklində olan bu örnəyin digər bir variantı da məlumdur:

Yarımı yarımasın,
Al geysin, qarımasın.
Məndən qeyri yar alsa,
Heç qoşa qarımasın.

5. Azca fərqli variantı belədir:
Eləmi qu məni,
Nə çağırır bu məni.

Yaylığın kəfən eylə,
Göz yaşında yu məni.

6. Bu vəsfi-hal Lələnin bir bayatısına oxşayır. Bu bayatı belədir:

Lələ bir kömə tikdi,
Ağzını günə tikdi.
Nə gedən var, nə gələn,
Kim bilir, kimə tikdi.

7. Bu örnəyin başqa bir variantı belədir:

Ay çilə-çilə qardaş,
Atın qamçıla, qardaş.
Gəl sənə bir söz deyim,
Bəxtin açıla, qardaş.

## NANAYLAR

1. Bu örnəyin başqa bir variantı var:

Ağpapaq oğlan, bəndə gəl, bəndə gəl,

Bu nanay əsasən Təzə İbiş, Çivinli, Köhnə İbiş, Bağçalı kəndlərində oxunurdu.

2. Nanayın digər variantı belədir:

Oy aman, Ay Becan, oy, amandı.

Bu nanay Mağaracıq və Qaraçanda kəndlərində çox oxunurdu.

3. Həmin örnəyin digər variantı “Gəlin nanayı”ndadır.
Qızıl bilərzik qoluna, qoluna.

4. Bu nanayın Təzə İbiş variantı belədir:

Ay lalam səni, ay lalam səni

## SÖYLƏYİCİLƏR HAQQINDA MƏLUMAT

*Alqışlar.* Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Qarğışlar.* Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Nağıl.* Məmmədiyənin nağılı. Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Rəvayətlər.***

*Arxadur*. Söyləyəni: Yusif baba, 76 yaşında (Ağbaba bölgəsi, Güllübulaq kəndi)

*Bəxt apararam. Tənbəl qız.* Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Qadın məkri. Altı daş, üstü daş.* Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Qarğa. Daşdəmir*. Söyləyəni: Güləhməd baba, 75 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Xaşıl əhvalatı. Eşşək əhvalatı.* Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Dünya qarışır.* Söyləyəni: Hacı baba, 70 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Mən gəlin idim, dillənməz idim*. Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Fırım tutub. Bircə sənə də minseydim*. Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Ağzım dada gəldi*. Söyləyəni: Güləhməd baba, 75 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Saman əhvalatı.* Söyləyəni: Yusif baba, 76 yaşında (Ağbaba bölgəsi, Güllübulaq kəndi)

*Dedim, deməmiş olum. Qapı açanım doğulub.* Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Qış əhvalatı.* Söyləyəni: Davud baba, 82 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Heç ağlamayın. Elə yaxşı axsayırdım ki.* Söyləyəni: Yusif baba, 76 yaşında (Ağbaba bölgəsi, Güllübulaq kəndi)

***Vəsfi-hallar.***

Söyləyənlər: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

Güləhməd baba, 75 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

Hacı baba, 70 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Bayatılar.***

Söyləyənlər: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

Güləhməd baba, 75 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Nanaylar.***

*Bəndə gəl, ay oğlan. Nargilə, Nargilə, Nargilə, yar.*

Söyləyəni: Hacı baba, 70 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Valam yana, valam yana, yana. Oy aman, oy aman, oy amandı.*

Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Sarıma qurban, sarıma qurban. Şıxşıxa bilərzik qoluna, qoluna.*

Söyləyəni: Güləhməd baba, 75 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Alma sənə, heyva mənə, nar sənə. Ay sarı köynək, sarı soldatları. Yandırın, qızlar, yandırın budaqlardan*

Söyləyəni: Hacı baba, 70 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Lalam səni, lalam səni, səni. Şaftalı dilim, dilim, dilim.*

Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Nanay, nanay, nanay, nanay. Əliyar, Əliyar, Əliyar, Əliyar*

Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*Ay sarı seyranı yar, seyranı yar. Ala gülbəngi, ala gülbəngi.*

Söyləyəni: Hacı baba, 70 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

*U leyli, u leyli, u leyli. Narı qoydum ləngəriyə, ləngəriyə.*

Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Deyimlər.*** Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Nazlamalar.*** Söyləyəni: Gövhər nənə, 81 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

***Oxşamalar.*** Söyləyəni: Fatma nənə, 93 yaşında (Ağbaba bölgəsi, Hamasa kəndi)

# KİTABIN İÇİNDƏKİLƏR

## NANAYLAR

